Bildiyimiz kimi massivin elementləri istifadəçi tərəfindən seçilmiş ədədlərdən və ya random funksiyasının köməyi ilə təsadüfi seçilmiş ədədlərdən ibarət ola bilər. Lakin, tətqiqat işinin əsas məqsədi nizamlanma alqoritmlərinin real problemlərin həllində tətbiqini göstərməkdir. Buna görə də, növbəti tətbiq sahəsində elementləri mikrokontrollerin analoq girişinə temperatur sensorundan alınmış dəyərlər olan massivin nizamlayacağıq (7).

Düzəldəcəyimiz Data Logger qurğusu 1 saniyə (günlük dəyərləri ölçmək üçün 1 saat aralıqlarla) aralıqlarla 30 dəfə mühitin temperaturunu ölçməli, həmin dəyərləri massivə yazmalı, massivi seçilmiş alqoritm əsasında nizamlamalı və vizuallaşdırmaq üçün ilkin dəyərləri nizamlanmış dəyərlərlə birlikdə microSD fleş yaddaşda.txt uzantılı fayl şəklində saxlamalıdır (8). Daha sonra Excel tətbiqi proqramının köməyi ilə alınmış nəticə bar graph və ya line graph şəklində nümayiş olunur (Şəkil 1).




Qurğuda nizamlayıcı kimi QuickSort alqoritmi tətbiq olunub. Buna əsas səbəb digər alqoritmlərin xüsusi ilə hollandiya bayrağı alqoritminin xeyli resurs tələb etməsi beləliklə icra zamanı stabilliyin pozulmasına səbəb olmasıdır (9). Arduino Uno ana kartı 16 meqahertz tezliyində işləyir və bu alqoritmlərin sürətli icrasına imkan verir. İstifadə olunan bütün elementlər onalar üçün tərtib olunmuş kitabxanaya aid funksiyalar tərəfindən idarə olunub. Onlardan <SD.h> yaddaş modulunun, <SPI.h> və <DS3231.h> zaman modulunun və <LiquidCrystal.h> kitabxanası isə LCD ekranın proqramlanması üçün istifadə olunub (10).

LM35 tempratur sensor digər elementlər kimi ana lövhə üzərindəki 5V-luq gərginlik mənbəyi ilə qidalanır və hər 1 dərəcə selsi üçün A3 analoq giriş pininə 10 milli volt verir. Lövhə üzərində 10 bitlik ADC (Anolog to digital converter) olduğundan analoqRead() funksiyası və aşağıdakı kod sətrləri ilə temperatur dəyərlərini ala bilərik.

```
int bit_deyer;
int volt_deyer;
int tempratur;
bit_deyer=analogRead(sensor_pin);
volt_deyer=(bit_deyer/1023.0)*5000;
tempratur=(volt_deyer/10.0);
```

File myFile, DS3231 rtc (SDA, SCL), LiquidCrystal ekran (2,3,4,5,6,7) verilən tipləri kitabxananın köməyi ilə uyğun obyektləri və onların qoşulduğu pinləri təyin edir. Serial. Begin (9600), ekran.begin (16,2), SD.begin () və rtc.begin () funksiyaları isə istifadə olunan elementləri aktivləşdirir (11).

```
if (SD.begin())
{ekran.setCursor(0,0);
```

```
ekran.print("MicroSD Yaddas");
ekran.setCursor(0,1);
ekran.print("karti hazirdi!");
Serial.println("Yaddas karti istifadeye hazirdir!");}
else
{ekran.setCursor(0,0);
ekran.print("MicroSD Yaddas");
ekran.setCursor(0,1);
ekran.print("karti tapilmadi!");
Serial.println("MicroSD Yaddas tapilmadi");
return;}
```

Proqram təminatında rtc.setTime (14,27,35) və rtc.setDate (10,5,2019) funksiyaları saat, gün, ay, il qiymətlərini elan etməyə imkan verir (12).

Massivin nizamlanması və yeni massivin elementlərinin yaddaşda fayla yazılması üçün aşağıdakı kod tərtib olunub:

```
quickSort(arr, 0, n-1); // evvelki fesilde izahı verilib
for (say=0; say<n; say++)
{myFile = SD.open("test.txt", FILE_WRITE);
if (myFile) {if(say==0)//dovrenin 1-ci elementine uygun
myFile.print(vaxt[say]); //vaxt massivinin 1 ci elementini cap ele.
else if (say==n-1) //dovrenin sonuncu elementine uygun
myFile.print(vaxt[n-1]); //vaxt massivinin sonuncu elementini cap ele.
else //dovrenin qalan elementlerine uygun
myFile.print (" "); //vaxt qalan elementlerinin evezine "bosluq" simvolu cap ele.
myFile.print (","); // Excel-de vaxt deyerleri ile tempratur deyerleri arasinda ayirici kimi "," istifade olunub (13).
myFile.println(arr[say]);
myFile.close();}
```

## Nəticə

Tətqiqat işində cəld nizamlanma üsulları və "Smart Home" modelli sistemlərdə mühitin tempratur dəyərlərinin ölçülməsi yönündə araşdırma aparılmışdır.

1. Öyrəndiyimiz bu alqoritmlər verilənlərin strukturlaşmış növü olan massivlərin səmərəli yollarla nizamlanmasını və böyük ölçülü dəyərlərin elektron formada sürətli emalını təmin edir (14).

2. QuickSort və 3-way QuickSort cəld nizamlanma alqoritmləri qeyd olunan dillərdən əlavə Arduino platformasında tərtib olunmuş və onların iş prinsipi, aralıq mərhələlər və alınan nəticələr Arduino Uno mikro proqramlayıcı ana kartı üzərində araşdırılmışdır. Alqoritmlərin yığılması üçün münasib dil kimi C++ proqramlaşdırma dili seçilmişdir. Bütün nəticələr C++ mühitində işləyən Arduino İDE proqramında alınmışdır (15).

3. İstifadə olunan alqoritmlərin "Smart Home" modelli ali məktəb laboratoriyasında tətbiqini göstərmək məqsədi ilə Arduino platformasında elementləri mikrokontrollerin giriş pinindən alınan mühitin temperatur qiymətləri olan massivin nizamlanması üçün Data logger qurğusu tərtib olunmuşdur (16). Əldə olunan ilkin dəyərlər sonrakı nizamlanmış dəyərlərlə birlikdə MicroSD yaddaşda.txt uzantılı mətn faylı şəklində saxlanılmış və Excel proqramında qrafik metodlarla nizamlanmanın nəticəsi nümayiş olunmuşdur (Şəkil 2).




## Ədəbiyyat

1. Qurbanov, A., Məmmədov, E., Hüseynova, A. (2010). Kompüter texnikası və proqramlaşdırma. Bakı. “Təhsil” NPM, 169 s.
2. Kərimov, S., İbrahimzadə, T. (2011). İnformatika. Dərslik. Bakı, Elm, 434 s.
3. Don, H., Johnson, E. (2015). Dudgeon "Array Signal Prossesing: concepts and techniquies".552 s.
4. Oxer, J. (2016). Hugh Blemings “Practical Arduino”: Second Edition. 903 s.
5. Algorithms in c++, Parts 1-4 Fundamentals. (2002). Robert Sedgeüick. 740 s.
6. Introduction to sorting algorithms. (2017). Holczer Balazs, Kindle Edition.
7. https://www.geeksforgeeks.org/sorting-terminology/
8. https://www.geeksforgeeks.org/sorting-algorithms/#sortfunction
9. https://www.geeksforgeeks.org/quick-sort/
10. https://www.geeksforgeeks.org/3-way-quicksort-dutch-national-flag/
11. https://www.toptal.com/developers/sorting-algorithms
12. https://mathbits.com/MathBits/CompSci/Arrays/Sorting.htm
13. https://mathbits.com/MathBits/CompSci/Arrays/Quick.htm
14. https://www.cs.rit.edu/~atk/Java/Sorting/QSortAlgorithm.java
15. https://stackoverflow.com/questions/50340068/how-to-implement-the-tree-sort-algorithm-in-python-in-binary-search-tree
16. https://howtomechatronics.com/tutorials/arduino/arduino-sd-card-data-logging-excel-tutorial

Göndərildi: 11.09.2021 Qəbul edildi: 09.11.2021

DOI: https://doi.org/10.36719/2706-6185/05/35-39

**Səxavət Böyükağa oğlu Əhmədli**
Bakı Dövlət Universiteti
magistrant
sexavet.99@mail.ru

## İSTİNTAQ SƏHVLƏRİNİN KRİMİNALİSTİK CƏHƏTLƏRİ

**Xülasə**

İstintaq səhvləri kifayət qədər geniş anlayışdır. O, özlüyündə ibtidai araşdırmanın aparılmasında kriminalistik səhvləri, Cinayət-Prosessual Qanunun tələblərini pozan istintaq xətalarını, habelə cinayət qanununun düzgün tətbiq edilməməsi ilə bağlı istintaq xətalarını ehtiva edir.

Qeyd edək ki, cinayətlərin istintaqı zamanı yol verilən səhvlərin əksəriyyəti həm də onların kriminal xarakterinə riayət edilməməsi ilə bağlıdır. İstintaq zamanı kriminalizm elminin müddəalarına heç də həmişə ciddi əməl olunmur. Bu halda, bu, istintaqın həyata keçirilməsi zamanı qeyri-sabitliyə gətirib çıxarır ki, bu da istintaqın hərtərəfli, tam və ubyektiv aparılmamasına gətirib çıxaracaq. Hüquq ədəbiyyatında kriminalizm elmində təhqiqat xətalarının kriminal xarakteristikası ilə bağlı çoxsaylı fikirlər mövcuddur.

***Açar sözlər:*** *cinayətlərin istintaqı, texniki-texnoloji səhvlər, fərziyyələr, istintaqın təşkili, taktiki əməliyyat*

**Sakhavat Boyukagha Ahmadli**
Baku State University
master student
sexavet.99@mail.ru

## Criminalistic aspects of investigative errors

**Abstract**

Investigative errors are a fairly broad concept. It includes in itself criminalistic errors in the conduct of the investigation, investigative errors in violation of the requirements of Criminal Procedure Law, as well as investigative errors in connection with the improper application of criminal law.

It should be noted that most of the mistakes made during the investigation of crimes are also due to non-observance of their criminalistic character. During the investigation, the provisions of criminality science are not always strictly observed. In this case, it leads toandandality during the implementation of the investigation, which will lead to the fact that the investigation is thorough, complete and ubyektiv not conducted. There are numerous opinions in the legal literature on the criminalistic characteristic of investigative errors in the science of criminalism.

***Keywords:*** *investigation of crimes, technical and technological errors, assumptions, organization of the investigation, tactical operation*

### Giriş

İstintaq səhvi, mövcud istintaq vəziyyətinin yanlış qavranılması və ya həll yolunun düzgün seçilməməsi, müstəntiqin qanunla tanınmayan, yanlış bir hərəkəti nəticəsində istintaq və ya cinayət işi üçün əhəmiyyətli olan nəticələrin əldə edilməməsidir.

İstintaq səhvlərinin məzmunu kriminalist, cinayət-hüquqi və Cinayət-Prosessual aspektlərini müəyyən edir.

Səhvlərin kriminalist aspektləri ibtidai araşdırma prosesində kriminalistikanın tələblərinin pozulması ilə bağlıdır.

Bölmənin struktur meyarına uyğun olaraq istintaq səhvlərinin təsnifatı müvafiq olaraq struktur-Sahə adlanır.

Struktur-sahə təsnifatı aşağıdakı qruplardan ibarətdir:

1) texniki-texnoloji səhvlər;
2) fərziyyələrin qurulması və yoxlanılması zamanı səhvlər;
3) istintaqın təşkili və planlaşdırılması zamanı səhvlər;
4) taktiki səhvlər.

Bu səhvlər istənilən kateqoriyaya aid cinayətlərin istintaqı üçün səciyyəvidir və istintaqın ilkin və sonrakı mərhələlərində də edilə bilər (Karagodin, Morozova, 2003: 7).

## Texniki-texnoloji səhvlər

Texniki səhvlər daha çox istintaq hərəkətlərinin aparılması zamanı zəruri qaydalara əməl olunmaması ilə (məsələn, texniki və məhkəmə vasitələrindən istifadə edilməməsi) bağlı meydana çıxır. Ən çox görülən bu kimi səhvlər baxış, axtarış və məhkəmə ekspertizalarının həyata keçirilməsi zamanı özünü göstrərir.

Bu səhv qrupunun mahiyyəti texniki və məhkəmə vasitələrinin ümumiyyətlə kifayət qədər istifadə edilməməsində və ya istifadə edilməməsindədir. Bu halda istintaq səhvinin vəziyyəti daha çox kriminalist-mütəxəssisin iştirakı olmadan istintaq hərəkətlərinin aparılmasında yaranır.Araşdırmalar göstərir ki, hadisə yerinə baxış zamanı mikro-obyektlərin, ultrabənövşəyi, infraqırmızı işıqlandırıcıların və s. aşkarlanması üçün texniki-kriminalist vasitələrdən kifayət qədər nadir hallarda istifadə olunur.

Texnoloji səhvlər texniki vasitələrdən istifadə edilərkən izlərin axtarılması prosesinə obyektlərin natamam cəlb edilməsini, nümunə götürülməsindəki səhvləri, zəruri texnoloji tövsiyələrə riayət etmədən müqayisəli tədqiqat üçün nümunələrin götürülməsini əhatə edir. Məsələn, bir müstəntiq qan izlərini əvvəlcədən qurutmadan qablaşdırır və ya torpaq nümunələri götürmək üçün texnoloji qaydalara əməl etmir və ya yanğın və partlayışlar zamanı yoxlama sərhədlərini səhv müəyyənləşdirir.

Texniki və texnoloji səhvlər sübut məlumatlarının toplanması, tədqiqi və saxlanması mərhələlərində ortaya çıxır və yüksək dərəcədə gecikir (Karagodin, Morozova, 2003: 8).

## Fərziyyələrin qurulması və yoxlanılması zamanı səhvlər

İstintaq və məhkəmə orqanlarının cinayət işi üzrə həqiqətin müəyyən edilməsinə dair fəaliyyəti keçmişdə baş vermiş hadisələrə, faktlara və hallara yönəlmiş olur. Bundan başqa, müstəntiq, təhqiqat aparan şəxs, yaxud məhkəmə həmin hadisələrin bilavasitə müşahidəçisi olmurlar. Ona görə də cinayət işi üzrə istintaq aparan müstəntiqin fəaliyyəti bilavasitə özünün müşahidə etmədiyi halların tədqiqinə yönəlir. Bu halların müəyyən edilməsi cinayətin maddi izləri və cinayət hadisəsi ilə əlaqədar olan halları müşahidə etmiş şəxslərin məlumatları vasitəsilə mümkündür. Deməli, müstəntiq istintaqını apardığı cinayət işinə dair faktları onları təsdiq edən digər faktların köməyi ilə müəyyən etməli olur. Bu isə o deməkdir ki, müstəntiqin cinayət işi üzrə halların müəyyən edilməsinə yönəlmiş fəaliyyəti idrak fəaliyyəti olub, təfəkkür prosesini təşkil edir. Müstəntiqin fəaliyyəti indiki faktlar əsasında keçmişdə mövcud olmuş faktları müəyyən etməkdən və onlar arasındakı səbəbli əlaqəni aydınlaşdırmaqdan ibarətdir. Müstəntiq cinayət işi üzrə faktiki halları (keçmiş zamanda artıq baş vermiş halları) düzgün müəyyən etmək üçün həmin faktların mövcudluğunun mümkün olan bütün konkret variantlarını aydınlaşdırmalı və yoxlamalıdır. Müstəntiqin tədqiq etdiyi faktların mövcud ola bildiyi bu cür konkret variantlar əsasında istintaq fərziyyələri yaranır.

Beləliklə, kriminalistik fərziyyələr müstəntiq və digər subyektlərin törədilmiş cinayət hadisəsi və onun ayrı-ayrı halları haqqında faktiki cəhətdən əsaslandırılmış, məntiqin qanunlarına uyğun olaraq qurduqları ehtimal xarakterli əqli nəticələridir (Saricalinskaya, 1999: 59).

Fərziyyələrin bütün cinayət işləri üzrə qurulmasını zəruri hesab etmək daha düzgündür. Belə ki, istintaqı aparan müstəntiq, habelə cinayət işinə baxan məhkəmə iş üzrə heç bir faktın bilavasitə müşahidəçisi olmur. Buna görə də onlar iş üçün əhəmiyyəti olan hər hansı bir faktı yalnız digər faktların köməyi ilə sübut etdikdən sonra müəyyən nəticəyə gələ bilərlər. Hətta istintaq zamanı hər

hansı bir faktın tam aydın olması belə həmin işlər üzrə fərziyyələrin qurulması ehtiyacını aradan qaldırmır.

Qeyd etmək lazımdır ki, istintaq fərziyyələrinin qurulması zamanı cinayət işinin istintaqını aparan müstəntiq bir sıra tələbələrə riayət etməlidir. Belə ki, həmin tələblərə riayət edilməməsi nəticəsində istintaq səhv yöndə aparılmış olar və nəticədə iş üzrə obyektiv həqiqət müəyyən edilməmiş qalar. Kriminalistika elminə əsasən istintaq fərziyyələrinin özünəməxsus şərtləri vardır.

Bu şərtlər aşağıdakılardan ibarətdir: 1) kriminalistik fərziyyələr aid olduqları hər hansı bir elmin ümumi müddəaları və qanunlarına uyğun gəlməli, onlarla ziddiyyət təşkil etməməlidir; 2) kriminalistik fərziyyələr arasında məntiqi ziddiyyət olmamalıdır; 3) cinayət hadisəsinin ayrı-ayrı hallarına dair irəli sürülən kriminalistik fərziyyələr bütünlükdə həmin hadisəyə aid olan ümumi fərziyyəyə uyğun gəlməlidir; 4) kriminalistik fərziyyələr elə qurulmalıdır ki, onların məhz istintaq hərəkətləri vasitəsilə yoxlanılması mümkün olsun; 5) kriminalistik fərziyyənin yoxlanılmasının mümkünlüyü real olmalıdır; 6) kriminalistik fərziyyələr yalnız faktiki məlumatlara əsaslanmalıdır; 7) kriminalistik fərziyyələrin qurulması üçün kifayət dərəcədə əsas olmalıdır; 8) kriminalistik fərziyyənin irəli sürülməsi konkret faktın müəyyən edilməsindən ötrü zəruri olmalıdır; 9) fərziyyə dəqiq formulə edilməli, alternativ xarakter daşımamalı və konkret olmalıdır (Saricalinskaya, 1999: 62).

## İstintaqın təşkili və planlaşdırılması zamanı yol verilən səhvlər

Azərbaycan Respublikasının Cinayət-Prosessual Məcəlləsinin 48.1-ci maddəsinə əsasən, cinayət təqibi üzrə icraat təhqiqatçı, müstəntiq, prokuror və ya məhkəmə tərəfindən bu Məcəllədə nəzərdə tutulmuş müddətlərdə elə başlanmalı və qurtarmalıdır ki:

1. sübutların vaxtında əldə olunması və tədqiq edilməsi təmin olunsun;

2.şəxslər onlara ittiham elan olunmasını, işlərinə baxılmasını və pozulmuş hüquqlarının bərpasını həddən artıq uzun müddət gözləməsinlər.

Cinayət prosesini həyata keçirən orqan hər bir halda aşağıdakıları təmin etməlidir ki:

1. haqqında həbs, ev dustaqlığı və ya girov qismində qətimkan tədbiri seçilmiş təqsirləndirilən şəxs qətimkan tədbiri seçildikdən sonra bu Məcəllənin 158 və 159-cu maddələrində nəzərdə tutulmuş müddətlər keçənədək ittihamın əsaslılığının müəyyən olunması üçün məhkəmə qarşısında dayana bilsin;

2. hər hansı cinayət işi başlandığı andan bu Məcəllənin 218-ci maddəsində nəzərdə tutulmuş müddətlərdə ittiham aktı ilə məhkəməyə göndərilsin və ya cinayət təqibinə xitam verilsin;

3. məhkəməyə daxil olmuş hər hansı cinayət işinə, məhkəməyədək sadələşdirilmiş icraat üzrə materiala və ya xüsusi ittiham qaydasında şikayətə, habelə çıxarılmış hökm və məhkəmənin digər qərarlarına dair şikayət və protestlərə bu Məcəllənin 298.2, 301.4, 391.1, 419.3, 426.2 və 427.1-ci maddələrində nəzərdə tutulmuş müddətlərdə baxılmağa başlansın (Criminal Procedure Code of the Republic of Azerbaijan, 2020: 70-71).

İstintaqın təşkili onun planlaşdırılması ilə sıx əlaqəlidir. Lakin onları eyniləşdirmək olmaz. İstintaqın təşkili daha geniş anlayış olub, planlaşdırmanı özündə ehtiva edir. Planlaşdırma istintaqın təşkilinin tərkib hissəsi kimi çıxış edir və onun elementlərindən biridir. Daha geniş anlayış olan istintaqın təşkili planlaşdırmadan əlavə digər elementləri də özündə birləşdirir.

İstintaqın təşkili, hər şeydən əvvəl, onun vaxtında planlaşdırılmasından başlayır. Çünki ibtidai istintaq mürəkkəb, çoxşaxəli və aktiv bir fəaliyyət olduğundan onun plansız həyata keçirilməsini təsəvvür etmək mümkün deyildir. Plansız və pərakəndə şəkildə həyata keçirilən istintaq yalnız təsadüf nəticəsində müvəffəqiyyətlə başa çata bilər (Saricalinskaya, 1999: 69).

Müstəntiq zəruri məlumatların toplanması, tədqiqi, yoxlanması, ümumiləşdirilməsi, başqa iştirakçıların fəaliyyətinin təşkili və əldə edilmiş bütün faktların cinayət işinin materiallarında qeyd edilməsi funksiyasını yerinə yetirir. Deməli, istintaqın təşkilini funksional idarəetmə strukturlarının yaradılması və həmin proses iştirakçıları arasında qarşılıqlı əlaqə sistemini yaradan bir fəaliyyət kimi müəyyən etmək olar. Təşkilati idarəetmə fəaliyyətinin əsas metodu istintaqın planlaşdırılmasıdır (4).

İstintaq planı cinayət işi üzrə həqiqəti müəyyən etmək üçün müstəntiq tərəfindən həyata keçirilməsi nəzərdə tutulan hərəkətlərin məqsədyönlü ardıcıllıqla müəyyən edilmiş sistemidir. İstintaq planı cinayət işinə dair müstəntiqin geniş praktik fəaliyyət proqramıdır. İstintaq planında hərəkətin məzmunu ilə yanaşı onun forması da nəzərdə tutulmalı, o cümlədən hərəkətin hansı üsulla ediləcəyi müəyyən olunmalıdır. Bu zaman müstəntiq əksər hallarda kriminalistika elminin istintaq təcrübəsi əsasında işləyib hazırladığı təklifləri rəhbər tutur, çünki bir çox istintaq hərəkətlərinin yerinə yetirilməsi qaydası qanunda kifayət qədər geniş nizama salınmamışdır (Saricalinskaya, 1999: 71).

## Taktiki səhvlər

Cinayətlərin istintaqı zamanı istintaqın daha səmərəli və keyfiyyətli aparılması məqsədilə taktiki əməliyyat həyata keçirilir. İstintaq və təhqiqat orqanları tərəfindən həll edilməli olan taktiki məsələlərə müvafiq olaraq planlaşdırılan və həyata keçirilən taktiki əməliyyatın özünəməxsus xüsusiyyətləri vardır.

Cinayətlərin tez açılmasında cinayətkarın vaxtında ifşa edilməsində hərtərəfli düşünülmüş və dəqiq planlaşdırılmış taktiki əməliyyatın rolu əvəzedilməzdir. Bu da aşağıdakı əlamətlərlə xarakterizə olunur. Belə ki, istintaq aparan şəxs istintaq, əməliyyat-axtarış hərəkətlərindən daha səmərəli və məqsədyönlü istifadə etməklə, taktiki məsələlərin keyfiyyətli həll edilməsi imkanına malik olur (5).

Eyni zamanda, kriminalistik və əməliyyat taktikasından daha geniş istifadə etmək üçün şərait yaranır. Bununla da müstəntiq və təhqiqat orqanı tərəfindən istifadə edilən faktiki məlumatların toplanması və hazırlanmasında təkrarlığa yol verilmir (Saricalinskaya, 1999: 91).

Cinayətlərin istintaqı zamanı planlaşdırılan və həyata keçirilən taktiki əməliyyat bir sıra tələblərə cavab verməlidir. Həmin tələblərin pozulması aşağıdakı formalarda özünü göstərə bilər:

- taktiki əməliyyat konkret bir taktiki məsələnin həllinə yönəldilməsə və onun dəqiq məqsədi olmasa;
- taktiki əməliyyatın səmərəli həyata keçirilməsi üçün müvafiq üsul və vasitələrdən optimal dərəjədə istifadə edilməsə;
- taktiki əməliyyat vaxyında planlaşdırılmasa (6).

Taktiki əməliyyat səmərəli həyata keçirilməlidir. Bu yalnız mərkəzləşdirilmiş və vahid rəhbərlik olduqda icraçılar arasında bu və ya digər əməliyyatın həyata keçirilməsi taktikası barədə razılıq təmin edildikdə və onların hərəkətləri əlaqələndirildikdə mümkündür.

Taktiki əməliyyat dedikdə istintaq şəraiti nəzərə alınmaqla cinayət işinin ümumi məqsədinə xidmət edən taktiki məsələlərin həll edilməsi məqsədi ilə cinayət-prosessual qanunvericiliyinin normalarına riayət etməklə əlaqələndirilmiş şəkildə həyata keçirilən hərəkətlər (istintaq, əməliyyat-axtarış, yoxlama-təftiş, vergi və s.) sistemi başa düşülür (7). Taktiki əməliyyata verilmiş anlayışdan görünür ki, hər bir taktiki əməliyyat öz aralarında əlaqələndirilmiş və koordinasiya edilmiş hərəkətlər sistemidir. Buraya istintaq, əməliyyat-axtarış, yoxlama təftiş və istintaq prosesində ortaya çıxan digər təşkilati xarakterli hərəkətlər aiddir. Qeyd edilən hərəkətlər nətijə etibarilə istintaqın ümumi məqsədinə xidmət etməklə yanaşı, bilavasitə istintaqın ayrı-ayrı taktiki məsələlərinin həll edilməsinə də kömək edir. Belə taktiki məsələlərin taktiki məzmunu istintaqı aparılan müvafiq cinayət işi üzrə sübutetmə predmeti ilə şərtləndirilir. Müvafiq olaraq taktiki əməliyyat prosessual qanunla nəzərdə tutulmuş istintaq müddəti ərzində başa çatdırılır (Saricalinskaya, 1999: 92).

## Nəticə

İstintaq prosesində taktiki əməliyyatın aparılmasını planlaşdıran müstəntiq aşağıdakı prinsiplərə riayət etməlidir (8):

- hər bir taktiki əməliyyata hazırlığın və həyata keçirilməsinin fərdiliyi prinsipi;
- taktiki əməliyyat aparılarkən istintaqı aparılan cinayət işinin kriminalistik xüsusiyyətlərinin nəzərə alınması;

- taktiki əməliyyatın aparılmasına hazırlaşarkən və həyata keçirərkən ƏET-nin tələb və müddəalarından istifadə edilməsinin zəruriliyi;
- dinamiklik prinsipi;
- hər bir taktiki əməliyyatın təşkilində kollegiallıq prinsipinin gözlənilməsi;
- etik normalara riayət edilməsi;
- taktiki əməliyyatın prosessual cəhətdən rəsmiləşdirilməsi.

Yuxarıda qeyd edilən prinsiplər taktiki əməliyyatın aparılmasının müxtəlif mərhələlərində həyata keçirilir. Bu prinsiplər həmin mərhələləri dəqiq müəyyən etməyə, onun məqsədini və bu məqsədə nail olma üsullarını araşdırmağa imkan verir (Saricalinskaya, 1999: 96).

Qeyd olunan prinsiplər bütün taktiki əməliyyatlara şamil olunur və həmin prinsiplərə riayət edilməməsi istintaqın bu və ya digər mərhələlərində taktiki səhvlərə gətirib çıxarır.

**Ədəbiyyat**

1. Karagodin, V., Morozova, E. (2003). Criminalistic Problems of detection and elimination of investigative errors: An educational and practical manual. Yekaterinburg: Publishing House of the Ural Legal Institute of the Ministry of Internal Affairs of Russia, 22 pages.
2. Sarialinskaya, K. (1999). Criminalism. Textbook for universities, Baku, "Hüquq ədəbiyyatı" publishing, 716 pages.
3. Criminal Procedure Code of the Republic of Azerbaijan. (2020). Baku, "Hüquq Yayın Evi" publishing, 840 pages.
4. https://www.pa.edu.az/library/5/35/554_movzu_10._kriminalistik_taktikanin_esaslari.pdf.
5. https://referat.ilkaddimlar.com/r/referatlar/huquq/pdf-6322.pdf.
6. http://anl.az/el/b/bx_eafn.pdf.
7. https://barassociation.az/uploads/journal/14.pdf.
8. http://transparency.az/NIS/H%C3%9CQUQ%20M%C3%9CHAF%C4%B0Z%C6%8F%20ORQ ANLARI.pdf.

Göndərilib: 06.09.2021 Qəbul edildi: 10.11.2021

DOI: https://doi.org/10.36719/2706-6185/05/40-44

**İxtiyar Bəxtiyar oğlu Xanızadə**
Milli Aviasiya Akademiyası
magistrant
ixtiyar_xanizade@mail.ru

# İNFORMASİYA TƏHLÜKƏSİZLİYİNİN TƏMİNİ PROBLEMLƏRİ

**Xülasə**

İnkişafın hazırkı mərhələsi yüksək texnologiyalı sənaye sahələrini əhatə edən güclü elmi-texniki inkişafla xarakterizə olunur. Beləliklə, informasiya-kommunikasiya texnologiyaları (İKT) XXI əsr cəmiyyətinin formalaşmasına təsir edən əsas amillərdən biridir. İnsanların güzəranının təhlükəsizliyinə, iş və təhsilinə, dövlətlə vətəndaş cəmiyyətinin qarşılıqlı fəaliyyətinə onların inqilabi təsiri durmadan artır. İKT dünya birliyinin inkişafı üçün getdikcə daha vacib stimula çevrilir. Bununla belə, daha dəqiq desək, ET-nin inkişafı həmişə mənfi sosial təsirlərlə, o cümlədən müxtəlif növ cinayətlərlə müşayiət olunur. Xüsusilə kompüter texnologiyasının sürətli inkişafı informasiyanın elektron emalı ilə bağlı cinayətlərin, o cümlədən cinayətlə əlaqəli terror növlərinin genişlənməsinə səbəb olmuşdur.Məqalədə hava limanlarında İnformasiya Təhlükəsizliyi problemləri və informasiya təhlükəsizliyinin yaratdığı kibertəhlükəsizlik araşdırılır. İnformasiyanın qeyri-qanuni əldə edilməsinə, informasiyanın mühafizəsi üsullarına, qanunsuz yolla əldə edilmiş məlumatlardan şəxsi maraqlar naminə istifadə edilməsinə, həyatı təmin edən müəssisələrin fəaliyyətinə müdaxilələrə xüsusi diqqət yetirilir.

***Açar sözlər:*** *informasiya, informasiya təhlükəsizliyi, kiberterrorizm*

**Ikhtiyar Bakhtiyar Khanizade**
National Aviation Academy
master student
ixtiyar_xanizade@mail.ru

## Problems of information security

**Abstract**

The present stage of development is characterized by strong scientific and technical development, which includes high-tech industries. Thus, information and communication technologies (ICT) are one of the main factors influencing the formation of 21st century society. Their revolutionary influence is constantly growing on the security of people's livelihoods, their work and education, and the interaction between the state and civil society. ICT is becoming more and more important stimulus for world community development. However, more precisely, ET development is always accompanied by negative social impacts, including various types of crimes. The rapid development of computer technology, in particular, has led to the expansion of crimes related to electronic processing of information, including crime-related types of terrorism.

The article explores the problems of Information Security at the Airports, and cyber security caused by information security. Particular attention is paid to the illegal acquisition of information, the methods used to protect information, the use of illegally obtained information for personal gain, and the interference in the operation of life support facilities.

***Keywords:*** *information, information security, cyberterrorizm*

## Giriş

İnformasiya təhlükəsizliyi mülki aviasiya obyektləri üçün ümumi təhlükəsizlik sisteminin ayrılmaz hissəsi kimi son zamanlar davamlı olaraq ortaya çıxan problemlərə görə getdikcə daha çox diqqəti cəlb edir ki, bu da insan həyatının bütün sahələrində informasiya texnologiyalarının tətbiqi

ilə əlaqədardır. Beynəlxalq Mülki Aviasiya Təşkilatı (ICAO) getdikcə daha çox mülki aviasiya obyektlərinin informasiya təhlükəsizliyinin təmin edilməsi məsələlərini həll etməyə yönəlmiş müəyyən tədbirlər həyata keçirir. Mülki aviasiya obyektlərinin informasiya təhlükəsizliyi sistemi məlumatların icazəsiz girişdən etibarlı qorunmasını təmin edən mütəşəkkil orqanlar, vasitələr, metodlar və tədbirlər kompleksidir.Bundan əlavə, informasiya təhlükəsizliyini təmin etmək üçün ən vacib şərtlər qanunauyğunluq, yetərlilik, şəxsiyyətin, cəmiyyətin və dövlətin maraqları tarazlığının qorunması, informasiya təhlükəsizliyinin təmin edilməsindən məsul işçilərin peşəkarlığı, məsuliyyəti, dövlət qurumları ilə qarşılıqlı əlaqəsidir.Bütün bu şərtlərə riayət edilmədən,heç bir informasiya təhlükəsizliyi sistemi potensial və real təhdidlərə qarşı lazımi səviyyədə qorunma təmin edə bilməz (1).

Terroroloqların fikrincə kiberterrorizm son dövrlərdə daha kəskin xarakterdir. **Kiberterrorizm (informasiya terrorizmi)**– kompyuterin yaddaşında saxlanılan və ya kompyuterlərin vahid sistem, şəbəkəyə birləşdirilən rabitə kanalları üzrə sirkulyasiya edən məlumata siyasi məqsədli hücumla ifadə olunan kompleks aksiyalı terror aktıdır. Kiberterrorizmin təhlükəsi ondadır ki, o milli sərhəd tanımır, bu növ terror aktları dünyanın istənilən yerindən həyata keçirilə bilər. İnformasiya fəzasında terroristi aşkara çıxartmaq çox çətindir, çünki, o bir neçə kompyuter vasitəsi ilə həyata keçirilir ki, bu da onun identifikasiya edilməsini və yerləşdiyi məkanın müəyyən edilməsini çətinləşdirir (2).

**İnformasiya** – təqdimat formasından asılı olmayaraq şəxslər, əşyalar, faktlar, hadisələr, təzahürlər, proseslər və anlayışlar haqqında məlumatlar və biliklərdir. İnformasiya kompyuterə daxil edilmiş verilənlər, proqram kodları, məktub, yaddaş qeydləri, işlər, düsturlar, sxemlər, çertyojlar, dioqramlar, məhsulun modelləri, prototiplər, elmi işlər, məhkəmə sənədləri və s. formalarda ola bilər. Öz şəxsi maraqlarını, o cümlədən iqtisadi, kommersiya və.s məqsədlərini reallaşdırmaq üçün insanlarda informasiyaya tələbat yaranır, həmin insanları informasiyanın istehlakçısı adlandırırlar.

**İnformasiya təhlükəsizliyi** - şəxslərin, təşkilatların və cəmiyyətin maraqlarına uyğun olaraq, informasiya mühitinin qorunmasının vəziyyəti, həmçinin informasiya təhlükəsizliyinin pozulması təhdidlərinin, bu təhdidlərin mənbələrinin, reallaşdırılması üsullarının və məqsədlərinin, təhlükəsizliyinin pozulmasına gətirib çıxaran digər şərait və hərəkətlərin vaxtında aşkar edilməsi və qarşısının alınması vəziyyəti başa düşülür (Okinava Charter for the Global Information Society, 2000).

Kiberhədələr bəzən ən güclü silah qədər təhlükəlidir. Kiberterrorçuların istifadə etdiyi bu növ silahları hətta informasiya silahları adlandırmaqla onları yeni növ kateqoriya kimi (silah növlərindən biri) qiymətləndirmək olar. İnformasiya silahı seçim üzrə fəaliyyət göstərə bilər. O, transsərhəd rabitəsi vasitəsilə həyata keçirilə bilər ki, bu da hücum mənbəyinin aşkar edilməsini qeyri-mümkün edir. Ona görə də informasiya silahı terrorçular üçün ideal vasitədir. İnformasiya terrorizmi isə bütöv bir dövlət üçün təhlükə ola bilər. Bu isə milli və beynəlxalq təhlükəsizlik üçün informasiya təhlükəsizliyini vacib faktor kimi dəyərləndirməyə zərurət yaradır.

İnformasiya – kommunikasiyası, o cümlədən kompyuter texnologiyalarının yaranması ilə eyni zamanda meydana gələn cinayətkarlıq problemləri içərisində kiberterrorizm xüsusi yer tutur. Kompyuter terrorçuluğunun arsenalına və ya onun əsas istiqamətlərinə - müxtəlif virusları, məntiqi bombaları - əvvəlcədən proqram üzrə qurulmuş və lazım olan anda işə düşə bilən komandaları və s. aid etmək olar. Müasir terrorçu interneti yeni silah kimi deyil, əsasən təşviqat aləti, informasiya ötürülməsi vasitəsi kimi istifadə edir. Ona görə də kompyuter terrorizmini, daha doğrusu kiberterrorçuluğu cəmiyyət üçün real təhlükə hesab etmək olar. Hal-hazırda etibarli müdafiə oluna bilən sistemlər demək olar ki, yox səviyyəsindədir. Deməli, kompyuter terrorizmi reallıqdır. Buna görə də bu istiqamətdə dövlət strukturları tərəfindən işlənən və tətbiq edilən texniki, hüquqi və təşkilati tədbirlərin həyata keçirilməsinə böyük ehtiyac vardır. Belə tədbirlər isə öz növbəsində kompyuter sistemlərinin müdafiəsinə fayda verə bilər (Okinava Charter for the Global Information Society, 2000).

Kiberterrorizm anlayışının mahiyyətinə müxtəlif yanaşmalar mövcuddur. Yeni və kifayət qədər öyrənilməmiş bir cinayət hadisəsi olaraq kiber terrorizm xüsusi diqqət və bəşəriyyət üçün təhlükəli

olan bu problemin həllinə xüsusi yanaşma tələb edir. Saytları zəbt etməklə, kiber terrorçular gizli məlumatlar da daxil olmaqla müxtəlif növ məlumatlar əldə edir. Narahatçılıq yaradan əsas problem terrorçuların internet, kiber resurslardan istifadə etməklə kütləvi qırğın silahını əldə etmək cəhdləridir. Növündən və xarakterindən asılı olmadan baş verə biləcək istənilən təhlükələrin qarşısının alınması, başqa sözlə sistemdə toplanan, saxlanan və emal olunan, eləcə də şəbəkə vasitəsi ilə ötürülən informasiyanın təhlükəsizliyinin təmin olunması məqsədilə indiyədək çoxlu sayda müxtəlif üsullar, vasitələr və tədbirlər sistemi işlənib hazırlanmışdır.

**Kiberterrorizm** – kompyuterin yaddaşında saxlanılan və ya kompyuterlərin vahid sistem, şəbəkəyə birləşdirilən rabitə kanalları üzrə sirkulyasiya edən məlumata siyasi məqsədli hücumla ifadə olunan kompleks aksiyalı terror aktıdır. Kiberterrorizmin təhlükəsi ondadır ki, o milli sərhəd tanımır və terror aktlarını dünyanın istənilən yerindən həyata keçirə bilər. İnformasiya təhlükəsizliyi problemi meydana çıxdığı ilk dövrlərdə informasiyanın qorunması üçün, təşkilati və fiziki tədbirlər həyata keçirilməyə başlamışdır. Lakin informasiya texnologiyalarının, o cümlədən kompyuter texnikasının və kommunikasiya avadanlıqlarının inkişafı informasiyanın qorunması məsələsinə daha ciddi və kompleks yanaşma zərurətini yaratdı. İlk dövrlərdə elə fikir formalaşmışdı ki, informasiyanın emalı və ötürülməsi sistemlərində təhlükəsizlik proqram vasitələrinin köməyi ilə daha asan təmin edilə bilər. Ona görə də həmin dövrlərdə informasiyanın qorunması üçün məhz proqram vasitələri daha çox inkişaf edirdi. Bu vasitələrin etibarlılığını artırmaq üçün əlavə olaraq, zəruri təşkilati tədbirlərin və fiziki qoruma mexanizmlərinin köməyindən istifadə edilir. Lakin təcrübə göstərdi ki, informasiyanın etibarlı qorunması üçün yalnız proqram vasitələrinin reallaşdırılması, hətta əlavə təşkilati tədbirlərin tətbiq edilməsi kifayət etmir. Real həyatda praktiki baxımdan informasiya təhlükəsizliyinə qarşı elə təhlükələr yaranır ki, onların qarşısını almaq üçün bu vasitələrin tətbiqi mümkün olmur, bəzən isə bu mexanizmlər arzu olunan nəticəni vermir. Məhz bu səbəb informasiyanın qorunması üçün texniki qurğuların və sistemlərin, o cümlədən aparat vasitələrinin intensiv inkişafına təkan verdi (Gasimov).

Kiberterrorizm internetin açıqlığından istifadə edərək hökümətləri və dövlətləri diskretidasiya etmək üçün terror istiqamətli saytların yerləşdirilməsi, saxta məlumatları daxil etməklə bu sistemləri işçi vəziyyətdən çıxarılması və s. fəaliyyətlə qorxu və həyəcan yaradır, ənənəvi terrorçuluğu özünəməxsusluğu ilə tamamlayır. Tədqiqatlar kiberterrorizmin 2 növünü fərqləndirirlər:

1. Kompyuter və kompyuter şəbəkələrinin köməyi ilə terrorist fəaliyyətin həyata keçirilməsi ("təmiz növ").
2. Bilavasitə terror aktı törətmək məqsədi ilə deyil, terrorçu qruplar üçün kiberfəzanın istifadəsi.

Kiberterrorizmin birinci növünü "kiberfəza" və "terror aktı" anlayışlarını birləşdirməklə müəyyən etmək olar (Vasenin).

Öz məqsədləri üçün partladıcı və ya silahdan istifadə edən adi terrorçudan fərqli olaraq kiberterrorist müasir informasiya texnologiyasından, kompyuter sistem və şəbəkələrindən, xüsusi proqram təminatından istifadə edir. Hər şeydən əvvəl bunlar məntiqi bombalar adlandırılan kompyuter proqram və resursları, informasiyaları sıradan çıxaran müxtəlif vasitələr "troyan" proqramları və informasiya silahının digər növləridir. Kiberfəzada terror aktını yerinə yetirmək üçün müxtəlif üsullar istifadə olunur:

1. Kiberfəzanın ayrı-ayrı elementlərinə ziyan vurmaq, elektrik qida şəbəkələrini dağıtmaq, maneələr, xüsusi proqramları istifadə etmək;
2. Kiberfəzanın strateji əhəmiyyət kəsb edən informasiya, proqram və texniki resurslarını müdafiə sustemlərinin dağıtmaq yolu ilə virusları tətbiq etməkdə - oğurlamaq və ya məhv etmək.
3. İnformasiya və idarəetmə sistemlərində proqram və informasiya təminatının normal fəaliyyətini pozmaq, dövlətin infrastrukturu haqqında informasiyanın funksional fəaliyyətlə bağlı qapalı informasiyanın açılması və təhlükəli məhvi, o cümlədən ictimai əhəmiyyətli və hərbi informasiya sistemlərinin, şifrələrin, informasiya sistemlərinin işinin pozulması, onların sirrlərinin konfidensiallığının pozulması və s.

4. Telekomunikasiya verilişləri kanallarının dezinformasiyanın genişləndirilməsi məqsədi ilə ələ keçirilməsi və terrorçu təşkilatların gücünü nümayiş etdirmək və öz istəklərini tələblərini elan etmək (Golubev).

| 2018-ci il | | | 2019-cu il | | | Sıralamada dəyişiklik |
|---|---|---|---|---|---|---|
| 1 | Zərərli kodlar/proqramlar* | ↑ | 1 | Zərərli kodlar/proqramlar* | ↑ | ⇔ |
| 2 | Veb-əsaslı hücumlar | ↑ | 2 | Veb-əsaslı hücumlar | ↑ | ⇔ |
| 3 | Veb proqram hücumları | ↑ | 3 | Veb proqram hücumları | ↑ | ⇔ |
| 4 | Botnetlər | ↓ | 4 | Botnetlər | ↓ | ⇔ |
| 5 | Xidmətin imtinası | ↑ | 5 | Xidmətin imtinası | ↑ | ⇔ |
| 6 | Spam | ↓ | 6 | Fiziki ziyan/oğurluq/zərər | → | ⇧ |
| 7 | Fişinq (saxta məktublar) | ↑ | 7 | Daxili təhdid | ↑ | ⇧ |
| 8 | Zəiflik müəyyən etmə alətləri | ↓ | 8 | Fişinq (saxta məktublar) | → | ⇩ |
| 9 | Məlumat sındırılması | ↑ | 9 | Spam | ↓ | ⇩ |
| 10 | Fiziki ziyan/oğurluq/zərər | ↑ | 10 | Zəiflik müəyyən etmə alətləri | ↑ | ⇩ |
| 11 | Daxili təhdid | → | 11 | Məlumat sındırılması | → | ⇩ |
| 12 | Məlumatın sızması | ↑ | 12 | İdentifikasıya oğurluğu | → | ⇧ |
| 13 | İdentifikasıya oğurluğu | ↑ | 13 | Məlumatın sızması | ↑ | ⇩ |
| 14 | Kiber-casusluq | ↑ | 14 | Girov götürmə alətləri | ↑ | ⇧ |
| 15 | Girov götürmə alətləri | ↓ | 15 | Kiber-casusluq | ↑ | ⇩ |

**Mənbə:** ENISA Təhlükə müstəvisi hesabatı

*soxulcanlar, troya atları, məntiqi bombalar və s.

**İzahat:**
Trendlər - ↑ artan, ↓ azalan, → stabil
Sıralama - ⇧ yüksəliş, ⇩ düşmə, ⇔ eyni

2018-2019-cu illər üçün hesablanmış cədvələ baxdıqda təhlükənin daima artdığı göz önünə gəlir. 15 faktordan yalnız biri daxili hədələr stabil olaraq qalır. Digər bütün informasiya və elektron idarəetməyə əsaslanan faktorlarda artımlar müşahidə olunur.

MA-da kiberterrorizm o qədər açıq və ciddi şəkil almışdır ki, bu sahədə qeyd edilən problemləri ətraflı tədqiq, təhlil etmək, öyrənmək, sonra isə bu hadisələrin qarşısını ala biləck tədbirlər, aktiv fəaliyyəti həyata keçirmək zərurəti yaranmışdır. Beynəlxalq aviasiya birliyi kiberterrorizmin xəbərdarlıq edilməsi probleminə böyük diqqət verir. Bu istiqamətdə İCAO müəyyən addımlar atmışdır. Belə ki, 1998-ci ilin oktyabrında İCAO-nun assambleyası bu problemin xüsusi olaraq hüquqi və texniki aspektlərinə fikir verilən bir səslə rezolyusiya qəbul etdi. A32-2 rezolyusiyası MA sahəsində əmkdaşlıq edən dövlətləri kiberterrorizmin artan təhlükəsinə qarşı səmərəli əks tədbirlərin tətbiqinə və işlənməsinə çağırır (Vasenin).




## Nəticə

Nəzərə alsaq ki, kibercinayətkarlığın dili, dini, milliyəti sərhəddi yoxdur və kibercinayətkarlığın xarakterik xüsusiyyətlərə malik olması bu növ cinayətkarlığa qarşı mübarizənin effektivliyini yalnız beynəlxalq əməkdaşlıq çərçivəsində mümkün edə bilər. Bu baxımdan informasiya təhlükəsizliyi və kibercinayətkarlıqla mübarizə Azərbaycan Respublikasının həm yerli qanunvericiliyində həmdə beynəlxalq norma və standartlara uyğun təmin edilməlidir. Kibercinayətkarlıq və kiberterrorizmlə mübarizə aparmağa qadir olan yeni orqanlar və onları istiqamətləndirən təşkilatlar yaratmaqla, özünün milli kadrlarını yaratmaqla kibercinayətkarlıqla məşğul olan trans milli orqanlara və təşkilatlara qoşulmalıdır (8).

## Ədəbiyyat

1. https://ict.az/az/content/353-in
2. http://elibrary.bsu.edu.az/files/books_400/N_407.pdf.
3. Okinava Charter for the Global Information Society. (2000). Adopted on July 22, Diplomatic Bulletin. No8. (Electronic resource) http://www.mert.ru/index.php?nodeid=1218.
4. Gasimov, V. Basics of information security.
5. Vasenin, V. Information security and computer terrorism. (Electronic resource) http://www.erime-research.ru.
6. Golubev, V. Cyber terrorism is a threat to national security.
7. Information Security, Textbook, Baku, "Economic University".
8. https://cert.gov.az/az/news-view/113-i

Göndərilib: 19.09.2021 Qəbul edildi: 16.11.2021

DOI: https://doi.org/10.36719/2706-6185/05/45-48

**Fatimə Vüqar qızı Əsgərli**
Bakı Dövlət Universiteti
magistrant
fatimasgarlii@gmail.com

# TÜRK DÖVLƏTLƏRİNDƏ COĞRAFİYA FƏNNİ ÜZRƏ TÜRK DÜNYASININ TƏDRİS EDİLMƏSİ

**Xülasə**

Müasir dövrdə coğrafiyanın tədrisində əsas məsələlərdən biri də türk dünyasının tədrisidir. Məqalədə türk ölkələrində tədris olunan coğrafiya fənninin türk dünyasının necə aparıldığı barədə məlumat verilir. Burada türk ölkələrindən olan coğrafiya dərslikləri təhlil edilmiş, türk dünyasının həmin kitablarda necə yerləşdiyinə aydınlıq gətirilmişdir. Azərbaycanda məktəb coğrafiyasının strukturu 1992-ci ildən sonra orta məktəb coğrafiyası tədrisində köklü dəyişikliklər baş verdi.

***Açar sözlər***: *dərslik, Azərbaycan, Türkiyə, Özbəkistan, Qırğızıstan, Qazaxıstan*

**Fatima Vugar Askerli**
Baku State University
master student
fatimasgarlii@gmail.com

## Teaching the Turkish world at Geography classes in Turkish countries

**Abstract**

One of the main issues in the teaching of geography in modern times is the teaching of the Turkic world. The article provides information on how the Turkic world is conducted in the subject of geography which is taught in the Turkic countries. Here, geography textbooks from Turkic countries were analyzed, and it was clarified how Turkic world was allocated in those books. The structure of school geography in Azerbaijan After 1992, radical changes took place in high school geography teaching.

***Keywords:*** *textbook, Azerbaijan, Turkey, Uzbekistan, Kyrgyzstan, Kazakhstan*

## Giriş

Türk xalqları tarixən formalaşan qədim xalqlardan biridir. Müasir dünyada türk dövlətlərinin birliyi ideyasının kökündə qədim sivilizasiya mənbələri, tarix boyu davam etmiş etnomədəni əlaqələri, tarixi parçalanma zamanı itirmədikləri, qoruyub saxladıqları və daim inkişaf etdirdikləri ortaq dəyərləri dayanır. Coğrafiyanın tədris olunmasında əsas mövzulardan biri də məhz türk dünyası mövzusudur. Coğrafiya dərsliklərində türk dünyasının tədrisini təhlil edək (Eminov, Səmədov, Əliyeva, 2019).

*Azərbaycanda* məktəb coğrafiyasının strukturu 1992-ci ildən sonra orta məktəb coğrafiyası tədrisində köklü dəyişikliklər baş verdi. *Azərbaycanda* orta təhsil pilləsində XI sinifdə Türk dünyası coğrafiyasının tədrisi o zaman üçün bir yenilik idi. Çünki, bu günə qədər Azərbaycanda coğrafiya təhsil proqramlarında Türk Dünyasına aid heç bir coğrafiya dərsi keçirilmirdi.

"Türk Dünyası Coğrafiyası" dərsliyi 2 bölmədən ibarət idi: Türk dünyası ölkələrinin fiziki iqtisadi coğrafiyasından bəhs olunan ümumi hissə və türk dövlətlərinin və qurumlarının coğrafiyasından bəhs olunan regional hissə (Əlizadə, Seyfullayeva, Şabanova, Aktoprak, 2020).

Dərs həftədə 1 dəfə, illik 34 saatlıq tədris planı var idi ki, bunun da 5 saatı əlavə saat idi.

Daha sonra Türk dünyası ayrıca dərslik kimi deyil, VI sinifdən XI sinifə kimi mövzuların daxilində keçirilməyə başlandı. Hazırda coğrafiya dərsliklərində Türk dünyası həm müstəqil mövzu

olaraq, həm də digər mövzuların tərkibində keçirilir. Müstəqil mövzu kimi türk dünyasına VII, IX və XI siniflərin hər birində 1 mövzu olaraq yer ayrılmışdır. Müstəqil mövzulara VII sinifdə "Türk dünyası birliyi", IX sinif də "Türk dünyasının sivilizasiyalararası əlaqələrdə rolu", XI sinifdə "Türk dünyası birliyi" (praktik dərs) aiddir (Əlizadə, Seyfullayeva, Şabanova, Aktoprak, 2018).

Coğrafiya fənni üzrə məzmun standartlarında vahid coğrafiya prinsipi əsasən gözlənilmişdir. Fiziki və iqtisadi coğrafiyanın sintezini təşkil edən alt standartlar ümumidən xüsusiyə doğru prinsipi ilə tərtib edilmişdir. Standartlarda ayrı-ayrı regionlar üzrə bilik və bacarıqlar ümumi şəkildə təqdim edilir. Azərbaycan Respublikası, türk dünyası və dünyanın müxtəlif regionları ümumi halda təmsil olunur. Coğrafiya kurikulumunda türk dünyası mövzusuna aid standartların ümumi sayı 7-dir. Siniflər üzrə aşağıdakı kimi paylanmışdır:

1. VII sinif üzrə 2
2. IX sinif üzrə 1
3. XI sinif üzrə 4.

*Türkiyədə* coğrafiya dərsi tədris proqramı ilə 9-cu sinifdən etibarən istifadə olunaraq yenilənmişdir. Orta təhsil müddətinin dəyişməsi ilə bərabər coğrafiya tədris proqramına əsasən dərs mövzuları 5 elm sahəsindən ibarət olmaqla tədris edilir. Təbiət elmləri, Bəşəri elmlər, Qlobal elmlər, Türkiyə, Ölkələr və Bölgələr ilə əhalidir. 4 il boyunca coğrafiyanın adları çəkilən bütün bölmələri ilə bağlı mövzular keçirilir (Qəribov, Seyfullayeva, Hümbətova, Şabanova, İsmayılova, 2018).

Türkiyədə coğrafiya dərsi cografiya adı ilə 9-cu sinifdən etibarən məcburi dərs kimi həftədə 2 saat keçirilir. Fənn elmləri və xarici dil sahələrində 9 və 10-cu siniflərdə məcburi, 11 və 12-ci siniflərdə isə seçmə dərs statusunu daşıyır. Sosial elmlər və Türkcə-riyaziyyat sahəsində isə coğrafiya dərsi 9-cu sinifdə məcburi dərs, 10-11-12-ci siniflərdə isə sahəvi dərs kimi keçirilir.

Türkiyənin coğrafiya dərsliklərində Türk dünyası ilə bağlı məlumat və tapşırıqlar mövzuların tərkibində verilmişdir. Məsələn, Türkiyənin XI sinif coğrafiya dərsliyində "Ekonomiye yön veren güç: doğal kaynaklar" mövzusunun Etkinlik blokunda Azərbaycan iqtisadiyyatının sahələr üzrə paylanmasının qrafiki verilmişdir (Qəribov, Alxasov, Hüseynli, Babayeva, 2018).

Özbəkistanda coğrafiya fənni 5-ci sinifdən 10-cu sinfə kimi tədris olunur. Burada coğrafiya dərslikləri özbək, türkmən, qazax, qırğız, qaraqalpaq, tacik və rus dillərindədir. Bu dərslikləri türk dünyası baxımından təhlil edək:

Özbəkistanın 5-ci sinif coğrafiya dərsliyində Türk dünyasına müstəqil mövzu kimi yer verilməsə də, "Coğrafi kəşflər və müasir coğrafiya" mövzusunda türk alimlərindən Əl-Xarəzmi, Əl-Biruni, Mahmud Kaşğarinin adları çəkilmişdir (Seyfullayeva, Şabanova, İmrani, 2018).

Özbəkistanın 6-ci sinif coğrafiya dərsliyində "İsti iqlim qurşaqları" mövzusunda Azərbaycan, Özbəkistan və Türkmənistanın iqlimi haqqında məlumat verilmişdir.

Özbəkistanın 7-ci sinif coğrafiya dərsliyində "Orta Asiyanın əhalisi və siyasi xəritəsi" mövzusunda bu ərazidə yaşayan türk xalqlarının adları çəkilir. Bundan əlavə, müstəqil türk dövlətləri olan Qazaxıstan, Özbəkistan, Türkmənistan, Qırğızıstanın adı çəkilmişdir.

Özbəkistanın 9-ci sinif coğrafiya dərsliyində "Dünyanın siyasi xəritəsi" mövzusunda 1991-ci ildə müstəqillik qazanan dövlətlər arasında türk dövlətlərinin də adları çəkilir.

"Asiya ölkələri" mövzusunda Mərkəzi Asiyaya aid olan türk dövlətləri sadalanır (Kulmatov, 2009). Müstəqil mövzu kimi "Qazaxıstan Respublikası", "Qırğızıstan Respublikası", "Türkmənistan Respublikası" və "Türkiyə Respublikası" mövzuları vardır. Burada bu türk dövlətlərinin faydalı qazıntıları, relyefi, iqlimi, çayları, gölləri, əhalisi, iqtisadiyyatı haqqında informasiya verilmişdir.

Özbəkistanın 10-cu sinif coğrafiya dərsliyində "Mərkəzi Asiya dövlətləri" mövzusunda şagirdlər burada yerləşən türk dövlətləri - Qazaxıstan, Qırğızıstan, Özbəkistan və Türkmənistan haqqında məlumat əldə edirlər.

Qırğızıstanda coğrafiya fənni 6-ci sinifdən 10-cu sinfə kimi tədris olunur. Burada coğrafiya dərslikləri qırğız, rus, özbək, tacik dillərindədir. Bu dərsliklərin türk dünyası baxımından təhlilinə baxaq (Kadyrkulov, Aliev, 2013):

Qırğızıstanın 6-cı sinif coğrafiya dərsliyind“ əYaşayış məntəqələri” mövzusunda Qırğızıstanın şəhərlərindən bəhs olunmuşdur.

“Dünyanın siyasi xəritəsində ölkələr” mövzusunda Qırğızıstan, Qazaxıstan və Özbəkistanın adları çəkilmişdir.

Qırğızıstanın 7-cı sinif coğrafiya dərsliyində “Daxili suların paylanması” mövzusunda türk dünyasında yerləşən Xəzər dənizi, Aral dənizi və Turan ovalığından, çaylardan və göllərdən bəhs edilmişdir (Osmonov, 2012).

“Cənub-qərbi və Şərqi Asiya” mövzusunda bu ərazilərdə türklərin yaşadığı vurğulanmış, Türkiyə və Qırğızıstanın adı çəkilmişdir.

“Orta Asiya” mövzusunda burada yaşayan əhali arasında qazaxlar və qırğızların olduğu deyilir.

“Şimal-şərqi Asiya” mövzusunda MDB-yə daxil olan Qazaxıstan və Özbəkistanın adları çəkilir.

Qırğızıstanın 7-cı sinif coğrafiya dərsliyində türk dünyasına aid müstəqil mövzular vardır. Bu mövzular “Qazaxıstan Respublikası”, “Özbəkistan Respublikası” və “Qırğız Respublikası”-dır (Barataliev, Alymkulova, 2012).

Qırğızıstanın 8-ci sinif coğrafiya dərsliyi Qırğızıstan Respublikasının fiziki coğrafiyası, 9-cu sinif coğrafiya dərsliyi isə Qırğızıstanın iqtisadi və sosial coğrafiyası dərsliyidir.

Qırğızıstanın 10-cu sinif coğrafiya dərsliyin “Rusiya Federasiyası” mövzusunda Rusiyada yaşayan türk xalqlarının adları çəkilmişdir və verilən cədvəldə Azərbaycan, Qazaxıstan, Qırğızıstan, Türkmənistan və Özbəkistanın sahəsi, əhalisi, paytaxtı, idarəetmə forması verilmişdir (Osmonov, Choduraev, 2011).

Qazaxıstanda coğrafiya fənni 7-ci sinifdən 11-ci sinfə kimi tədris olunur. Burada coğrafiya fənni qazax və rus dillərində keçirilir. Bu dərsliklərin türk dünyası baxımından təhlilinə baxaq:

Qazaxıstanın 7-ci sinif coğrafiya dərsliyində “DİL ailələri və dünya xalqları” mövzusunda verilən cədvəldə Altay dil ailəsi və ona daxil olan türk xalqlarının adları çəkilmişdir.

“Avtomobil, hava, su, boru kəmər nəqliyyatı” mövzusunda Qazaxıstan, Özbəkistan və Azərbaycanın adı çəkilir (Egorina, Nurkenova, Shimina, 2017).

Qazaxıstanın 8-ci sinif coğrafiya dərsliyində Əhalinin siyahıya alınması” mövzusunda Azərbaycan, Qazaxıstan, Qırğızıstan, Türkmənistan, Özbəkistanın əhalisinin gələcək üçün proqnozu verilmişdir.

“Quru sularının ekoloji problemləri” mövzusunda Qazaxıstanın ekoloji problemlərindən bəhs olunur.

Qazaxıstanın 9-cu sinif coğrafiya dərsliyi 2 hissədən ibarət olan Qazaxıstanın coğrafiyasından ibarətdir (Karatabanov, Kuanysheva, Baimetova, Dzhanaleeva, 2019). Qazaxıstanın 10-cu sinif coğrafiya dərsliyind Fiziki, coğrafi və iqtisadi amillərin geosiyasi siyasətdə əhəmiyyəti” mövzusunda Türkmənistan, Azərbaycan və Qazaxıstanın adları çəkilmişdir.

Qazaxıstanın 11-ci sinif coğrafiya dərsliyind “Dövlət və təbiət idarəçiliyinin qanunvericilik aspektləri” mövzusunda Qazaxıstandan bəhs olunur.

“Davamlı inkişafa keçid” mövzusunda Qazaxıstanın davamlı inkişaf konsepsiyasından bəhs olunmuşdur (Usikov, Egorina, Usikova, Zabenova, 2019).

“Qazaxıstan iqtisadiyyatının sektor quruluşu”, “Qazaxıstan bölgələrinin iqtisadiyyatı” və “İnvestisiya cəlbediciliyi - Qazaxıstan iqtisadiyyatının bir qoludur” mövzularında bu ölkənin iqtisadiyyatı haqqında informasiya verilir.

“Qazaxıstan bölgələrinin bərabərləşdirilməsi” mövzusunda ölkənin ərazi bölgüsünün qeyri-bərabərliyindən, bərabərləşdirmə siyasətindən danışılır.

“Xüsusi iqtisadi zonalar və Qazaxıstanın texnoparkları” mövzusunda Qazaxıstanın texnoparkları haqqında məlumat verilmişdir (Saitov, Abilmazhinova, Kaymuldinova, 2019).

“Qazaxıstanın qrup təşəbbüsləri” mövzusunda Qazaxıstandan bəhs olunmuşdur.

“Qazaxıstanın geosiyasi mövqeyi”, “Qazaxıstanın geosiyasi təhlükəsizliyi”, “Qazaxıstanın geosiyasi inteqrasiyası” mövzularında Qazaxıstan haqqında məlumat verilmişdir.

“Asiyanın mərkəzində Böüyk çöl ölkəsi” mövzusunda Türkmənistan, Özbəkistan, Qırğızıstan və Qazaxıstanın adları çəkilir.

"Qazaxıstan ərazisində bəşəriyyətin qlobal problemlərinin təzahürü" mövzusunda Aral dənizindən, səhralaşmadan bəhs edilmişdir (Kaimuldinova, 2019).

**Ədəbiyyat**


1. Eminov, Z., Səmədov, Q., Əliyeva, A. (2019). "Coğrafiya", VIII sinif, Çaşıoğlu.
2. Əlizadə, E., Seyfullayeva, N., Şabanova, Y., Aktoprak, İ. (2020). "Coğrafiya", IX sinif, Bakı.
3. Əlizadə, E., Seyfullayeva, N., Şabanova, Y., Aktoprak, İ. (2018). "Coğrafiya", VI sinif, Bakı.
4. Qəribov, Y., Seyfullayeva, N., Hümbətova, Ş., Şabanova, Y., İsmayılova, T. (2018). "Coğrafiya", VII sinif, Bakı.
5. Qəribov, Y., Alxasov, O., Hüseynli, Ş., Babayeva, M. (2018). "Coğrafiya". X sinif, Bakı.
6. Seyfullayeva, N., Şabanova, Y., İmrani, Z. (2018). "Coğrafiya", XI sinif, Bakınəşr.
7. Kulmatov, T. (2009). "Physical Geography", 6th grade, Aditi.
8. Kadyrkulov, M., Aliev, Z. (2013). "Materikterdin jana oceanardyn geography", 7th grade, Insanat.
9. Osmonov, A. (2012). "Geography", 8th grade, Insanat.
10. Barataliev, O., Alymkulova, N., (2012). "Geography", 9th grade, Insanat.
11. Osmonov, A., Choduraev, T. (2011). "Duinonun ekonomikalyk jana sotsialdyk geographyy", 10th grade, Insanat.
12. Egorina, A., Nurkenova, S., Shimina, E. (2017). "Geography", Grade 7, Atamura.
13. Karatabanov, R., Kuanysheva, G., Baimetova, Zh., Dzhanaleeva, K. (2019) "Geography", 8th grade, Almatykitap.
14. Usikov, V., Egorina, A., Usikova, A., Zabenova, G. (2019). "Geography", Grade 9, Atamura.
15. Saitov, A., Abilmazhinova, S., Kaymuldinova, K. (2019). "Geography", grade 10, Mektep.
16. Kaimuldinova, K. (2019). "Geography", grade 11, Mektep.


Göndərildi: 08.09.2021 Qəbul edildi: 11.11.2021

DOI: https://doi.org/10.36719/2706-6185/05/49-53

**Tural Bəşir oğlu Tağıyev**
Bakı Dövlət Universiteti
magistrant
tural.taqiyev93@gmail.com

# XƏZƏRSAHİLİ AKKUMULYATİV DÜZƏNLİKLƏRİN GEOMORFOLOJİ XÜSUSİYYƏTLƏRİNİN TORPAQLARIN MƏNİMSƏNİLMƏSİNƏ TƏSİRİ

**Xülasə**

Ərazinin morfogenetik xüsusiyyətləri, morfometrik göstəriciləri, mailliyi, görmə qabiliyyəti, torpaqların müxtəlifliyi, onlarda humusun miqdarı, quruluşu, rütubəti və kimyəvi xüsusiyyətləri və s. xassələrə birbaşa təsir göstərir. Torpaq örtüyünün özü ərazinin müxtəlif təyinatlı inkişaf səviyyəsini müəyyən edən əsas amillərdən biridir. Xəzər sahili düzənliklərində ərazinin geomorfoloji şəraiti və torpaqların işlənməsinin əsas istiqamətləri müəyyən edilmişdir.

***Açar sözlər:*** *akkymulyativ düzənliklər, torpaq tipləri, mənimsənilmə istiqamətləri*

**Tural Bashir Taghiyev**
Baku State University
master student
tural.taqiyev93@gmail.com

## Influence of geomorphological features of Caspian accumulative plains on land development

**Abstract**

Morphogenetic characteristics of the area, morphometric indicators such as, the slope, the visibility, the diversity of soils, the amount of humus in them, the structure, moisture and chemical properties, etc. directly affects the properties. Land cover itself is one of the main factors determining the level of development of the area for different purposes. Geomorphological conditions of the area and the main directions of land development have been identified in the Caspian coastal plains.

***Keywords:*** *accumulative plains, land types, directions of development*

## Giriş

Relyef əsas torpaq əmələgətirən amillər sırasına daxildir. Ərazinin morfogenetik xüsusiyyətləri, yamacların meyilliyi, baxarlılığı kimi morfometrik göstəricilər torpaqların müxtəlifliyinə, onlarda humusun miqdarı, strukturu, nəm və kimvəvi xassələri və s. xüsusiyyətlərinə birbaşa təsir göstərir. Torpaq örtüyünün özü isə ərazinin müxtəlif məqsədli mənimsəmə səviyyəsini müəyyən edən başlıca amil sırasına daxildir.

Məqalədə tədqiqat sahəsi olaraq Xəzərin dənizin Azərbaycan sahillərinin 200 m mütləq yüksəkliklərə qədər olan akkumulyativ mənşəli düzənlikləri götürülmüşdür. Tədqiqat sahəsində əsas oroqrafik vahidlər Samur-Dəvəçi ovalığı, Boğaz düzənliyi Abşeron yarımadasının sahilləri, Cənub-Şərqi Şirvan, Salyan düzü, Lənkəran ovalığıdır. Ərazinin əsas geomorfoloji elementləri allüvial-prolüvial düzənliklər, akkumulyativ dəniz düzənlikləri və abrazion akkumulyativ dəniz düzənlikləridir. Ümumi halda ərazidə meyillik 0-20$^o$ arasında dəyişsədə, 0-5$^o$ meyilliyə malik ərazilər üstünlük təşkil edir (85%). Baxarlılıq göstəricisi üzrə demək olar ki, əksər istiqamətlərdə bərabərlik müşahidə edilir. Bununla belə düz səthlər nisbi üstünlüyə malikdir (17%). Bu da böyük bir hissəsinin əsasən əyilmə zonasına uyğun gəlməsi ilə əlaqədardır. Tədqiqat məqsədilə 4 geomorfoloji rayon daxilində geomorfoloji şəraitə və ərazinin mənimsənilməsinə ayrı-ayrılıqda nəzər yetirək (Mammadov, 2007: 856).

Abşeron yarımadası şimalda Giləzi burnu ilə, cənubda Səngəçal burnununa qədər sahəni əhatə edir. Qərbi Abşeronda antiklinal struktrurlara uyğun gələn alçaq tirələrə rast gəlinir. Bunların şimal yamaclarında mütləq hündürlüyü 300-350 m-ə çatan yüksək dəniz terrasları vardır. Qərbi Abşeronda yarğan-qobu şəbəkəsinin inkişafı müşahidə edilir. Cənub-Qərbi Abşeronın xarakterik relyef formaları kimi Güzdək və Bakı platolarını, Bakı muldası və antiklinal strukturların yerində yaranmış dərələri misal göstərmək olar. Mərkəzi Abşeronda səthi çox hamarlanmış alçaq tirələr və yüksəkliklər, sinklinal zonalarda isə çoxunda duzlu göllər yerləşən çökəklərlə rast gəlinir. Ərazidə Xəzər terraslarının bir neçə səviyyəsinə geniş sahədə rast gəlinir. Burada palçıq vulkanları və qır örtüyü ilə zirehlənmiş yüksəkliklərin də yer tutduğu xüsusi qeyd edilməlidir. Yarımadanın Fatmayı-Zığ antiklinalından şərqdə yerləşən hissəsinin relyefini düzənliklər təşkil edir (Müseyibov, Quliyev, 2018: 129-130).

Abşeron geomorfoloji rayonunda subtropiklər üçün xarakterik olan boz-qonur, primitiv boz torpaq, qonur, açıq-şabalıdı torpaqlar, şoranlar və şorakətlər yayılmışdır.

Aqroiqlim ehtiyatlarının olması burada müxtəlif bitkilərin vegetesiya dövründə tələb olunan səviyyədə istiliyin olması əraziyə xas olan bitkilərin becərilməsi üçün münbit şərait yaratmışdır. Bu ərazinin təbii şəraiti tərəvəzçiliyin, heyvandarlığın, üzümçülüyün, subtropik meyvəçiliyin (əncir, zeytun, püstə) inikişaf etdirilməsinə imkan verir. Ərazi aid kosmik şəkillərin deşifrələnməsi ilə əldə olunmuş xəritə sxemə əsasən (Şəkil 1) aydın görünür ki, ərazidə əkin məqsədli ərazilər azlıq təşkil edir.

**Şəkil 1. Abşeron rayonunun ərazi**




**istifadəsi xəritə-sxemi**

**Şəkil. 2. Samur-Dəvəçi rayonun ərazi**




**istifadəsi xəritəsi**

Samur-Dəvəçi ovalığının enli daxili zonası allüvial-prolüvial, sahil zonası isə dəniz akkumulyativ düzənliklərdən təşkil olunmuşdur. Hər iki düzənlik zonaları sahəsində akkumulyasiya sürəti dağətəyindən sahilə tərəf tədricən azaldığından bu intensiv əyilmə zonasında səthi batıq düzənliklər yaranmamışdır (Müseyibov, Quliyev, 2018: 112).

Samir-Dəvəçi ovalığının torpaq örtüyü mürəkkəbdir. Ovalığın Şollar hissəsində əsasən karbotansız allüvial-çəmən-meşə və meşə altından çıxmış yuyulmuş qəhvəyi torpaqlar yayılmışdır. Şabran ərazisindən cənubda (Siyəzənə qədər) boz və çəmən-boz torpaqlar, ondan cənub-şərqdə isə şorakətvari boz-qonur torpaqlar üstünlük təşkil edir. Karbonatsız allüvial çəmən, yuyulmuş qəhvəyi torpaqlar, tərəvəzçilik, üzümçülük və bağçılıq üçün yararlıdır. Dəniz sahili boyu (xüsusilə Şabran rayonu ərazisində) qum təpələri dar bir zolaq təşkil edir.

Samur-Dəvəçi ovalığında Qusarçay, Qudyalçay, Qaraçay, Vəlvələçayın əlverişli meliorativ şəraitə malik geniş dərələrində, gətirmə konuslarında səpələnən, kiçik areallı aqrokomplekslər formalaşmış və genişlənərək meşə massivlərini sıxışdırmışdır. Samur-Dəvəçi ovalığının gillərin, qum daşlarının geniş yayıldığı genişlənmiş terrasların, gətirmə konuslarının, allüvial, allüvial-

prollüvial, dellüvial düzənliklərində quru çöllər yaranmışdır. Bu ərazilər qədim zamandan suvarma əkinçiliyinə cəlb edilmiş və daha çox mənimsənilmiş komplekslərdəndir. Hazırda quru çöllərin əksəriyyətinin açıq şabalıdı, çəmən-qəhvəyi torpaqlarıda bağ-plantasiyalar, taxıl-tərəvəz, bostan əkinləri və otlaq-biçənəklər salınmışdır. Şabran və Siyəzən ərazisində hamarlanmış yamaclarda yaranan yovşanlı-topallı, yovşanlı-şiyavlı, topalotulu, efemerli quru çölləri biçənək, tərəvəz, bostan əkinləri və s. ilə əvəzlənmişdir. Meşə kolluqlar və meşə-çəmən Samur-Dəvəçi ovalığı, Sabiroba-Muxtadır-Meşəli xətti üzrə uzanan dənizsahili zolağa məxsus landşaftdır. Qırılmış meşələrin yerində yaranan talalar moruq, qaratikan, zirinc kollarından ibarət cəngəlliklər formalaşmışdır. Çəmən-bataqlıq və düzən-çəmən kompleksləri vaxtilə Samur-Dəvəçi ovalığında geniş massivləri tuturdu. Meliorativ tədbirlər nəticəsində bataqlıqların çox hissəsi qurudulmuş və əkin, biçənək, taxıl və s. sahələri salınmışdır. Samur-Dəvəçi ovalığının boz-qəhvəyi torpaqlarında formalaşan qaratikanlı, yovşanlı-kollu çöllərin yerində komplekslərin 35%-ni seliteb-bağ, 47%- ni əkin, biçənək, bağ, 18%-ni isə texnogen modifikasiyalar tutur (Qəribov, İsmayılova, Sədullayev, 2014: 114-115).

Cənub-Şərqi Şirvan düzü Şərqi Kür depressiyasının bir hissəsini təşkil edir.Lakin Kür-Araz ovalığının qalan hissələrindın fərqli olaraq,burada relyefin struktur formaları və inversion qırışıqlıq zonaları, palçıq vulkanı morfostrukturları təşəkkül tapmışdır.Bu morfostrukturun əsas hisəsini səthi hamar dəniz və allüvial-dəniz düzənlikləri təşkil edir (Müseyibov, Quliyev, 2018: 176).

Cənub-şərqi Şirvan çöllərinin torpaqlarını vaxtilə ənənəvi olaraq köçəri heyvandarlıq üçün istifadə edilmişdir. Ərazi irriqasiya kanalları vasitəsi ilə suvarılırdı, ancaq, intensiv suvarma torpağın şoranlaşması ilə nəticələnmişdir. Keçən əsrin 60-cı illərdə torpaq öz məhsuldarlığını itirmiş və bu yerlərdə pambıq və tərəvəz bitkiləri əkilməsi gəlirli olmamışdır. Əkilən yerlər ancaq Yenikənd kəndinin ətrafındakı ərazilərdə mövcudluğunu saxladı. Salyan və Neftçala rayonlarında kənd təsərrüfatında üstünlük taxılçılığa və tərəvəzçiliyə verilir, bəzi yerlərdə meyvəçilik və heyvandalıqla da məşğul olurlar (Məmmədov, 2009: 120). Xəzər dənizinin səviyyə tərəddüdləri torpaqları (xüsusilə Neftçala rayonunda) yararsız hala salır və mənimsənilməsinə mane olur. Torpaq islahatından (1996 il) sonra əkin yerlərinin sahəsi 1999-ı ilə qədər azalmışdır. Hazırda isə əkilən yerlərin sahəsi sürətlə çoxalır. Regionda ev heyvanlarının sayı davamlı surətdə artmaqda davam edir. Hədsiz dərəcədə otarılma nəticəsində, həm ətraf ərazilərdə və həm də Şirvan Milli Parkının içərilərində güclü deqradasiya və səhralaşma prosesi baş verir. Cənub–Şərqi Şirvan düzünün bir hissəsində Şirvan Milli Parkı təşkil edilmişdir. Şirvan Milli Parkı sərhədləri daxilində genetik əlamətlərinə görə abrazion-akkumlyativ, allüvial-delta, akkumulyativ-dəniz, şoranlıq-laqun və şoranlıq-deflyasiya düzənlik tipləri ayrılır (Məmmədov, 2009: 89).

Lənkəran ovalığı rayonu şimaldan cənuba ensizləşir və sadə relyefə malikdir. Ərazinin relyefi Xəzər dənizinin səviyyəsinin reqressiv tərəddüdü və dağlardan gətirilmə akkumulyasiya materiallarının ovalığa toplanması nəticəsində formalaşmışdır. Lənkəran ovalığının qərbində gilli dellüvial və gillicəli dellüvial və dellüvial-allüvial çöküntülər daha geniş yayılmışdır. Ovalığın morfosklupturlarının formalaşmasına abraziya prosesləri ilə yanaşı çayların fəaliyyəti mühüm təsir edən amildir. Lənkəran regionu Azərbaycanın başqa regionları ilə müqayisədə sıx çay şəbəkəsi ilə diqqət çəkir.

Bu rayonda zəif parçalanmış ovalıq və düzənliklərin çəmən-meşə landşaftı geniş yer tutur. Bu ərazi üçün dəniz terraslarının, çayların gətirmə konusu səciyyəvi xüsusiyyət daşıyır. Qeyd edilən relyef formaları allüvial, allüvial-prolüvial, dördüncü dövrün dəniz çöküntüləri ilə örtülmüşdür. Gətirmə konuslarından ən böyükləri kimi Bolqarçayın və Lənkərançayın gətirmə konusları xüsusi yer tutur. Tarixi dövrlərdə bu landşaft tipinin sərhədləri daxilində geniş bataqlıq sahələrinin və düzən meşələrinin olmasına dair məlumatlar öz əksini tapır (Cavadov, 2016). Bu da şirin qrunt sularının səthə yaxınlığı və zənginliyi ilə bağlı olmuşdur. Lakin son 100 il Lənkəran ovalığının cənubunda iri miqyaslı meliorasiya işlərinin (qurutma) aparılması, meşələrin qırılması, yaşayış məskənlərinin genişlənməsi nəticəsində torpaq-bitki örtüyündə kəskin dəyişikliklər baş vermiş, nəticədə bu landşaft tipi üçün səciyyəvi Hirkan meşələrinin düzənlik tipi ya tamamilə qırılmış, ya da fraqmentlər şəklində Astara və Lənkəran rayonları ərazisində saxlanmışdır (6). XX əsrin ikinci

yarısından etibarən təsvir edilən landşaft sahəsində intensiv suvarmaya daim ehtiyacı olan çay plantasiyalarının və tərəvəz sahələrinin salınması bəzi sahələrdə qruntun yenidən qalxmasına gətirib çıxarmış, bataqlaşmanın yenidən bərpası üçün şərait formalaşmışdır. Zəif parçalanmış ovalıq və düzənliklərinin çəmən-meşə landşaftı üçün podzollu sarı-qleyli və podzollu- sarı qleyləşmiş torpaqlar çox geniş yayılmışdır. Bundan başqa ərazidə vaxtilə geniş yayılmış bataqlıq-çəmən, çəmən və bataqlı torpaqlara da rast gəlinir.

**Şəkil 3. Cənub-Şərqi Şirvan rayonunun ərazi istifadəsi xəritəsi**




**Şəkil 4. Lənkəran rayonunun ərazi istifadəsi xəritəsi**




Çay əkinləri əsasən Lənkəran ovalığının rütubətli iqlim şəraitinə malik olan sahələrində salınmışdır. Çay plantasiyaları əsasən Lənkəran, Astara və Masallı inzibati rayonları ərazisinə uyğun gəlir. Müstəqilliyimizin ilk illərində bazar iqtisadiyyatı şəraitində çayçılıq təsərrüfatı üzrə də aqrar islahatı aparılaraq çay plantasiyaları tamamilə özəlləşdirilmişdir. Sahibkarlar ilk illərdə çay emalı sənayesinin zəifləməsi ilə əlaqədar olaraq çay plantasiyalarının xeyli hissəsini məhv edərək yerində taxıl, kartof, tərəvəz və s. kimi özlərinə xeyirli və dövrün tələbatına uyğun bitkilərin becərilməsinə başlamışdırlar. Rayonda sitrus meyvəçiliyinin inkişafı üçün potensialı çoxdur. Sitrus meyvəçiliyi Lənkəran, Astara və qismən də Masallı inzibati rayonları ərazisində geniş yer tutur. Hazırda həm çayçılıq həm də sitrus meyvəçiliyinin inkişafı üzrə dövlət proqramları icra olunur (7).

## Nəticə

Dənizsahili ovalığın cənub hissəsində alçaq terraslarda relyefin çökək, əsasən qrunt suyu torpaq səthinə yaxın yerlərində suvarılan qleyli-sarı torpaqlar yayılmışdır. Bu torpaqlar allüvial gillicəli və dəniz çöküntüləri üzərində inkişaf etmişdir. Təsvir edilən torpaqların yayıldığı ərazilər intensiv şəkildə mənimsənilmiş və təsərrüfat fəaliyyətinin təsiri altında torpaq ciddi dəyişikliklərə məruz qalmışdır. Uzun müddət və çox zaman düzgün olmayan suvarma bu torpaqlarda irriqasiya eroziya prosesinin baş verməsinə gətirib çıxarır. Suvarma eroziyasının təsiri nəticəsində meylli və hətta az meylli sahələrdə suvarmanı düzgün aparmadıqda torpağın üst qatında qida maddələri yuyulub sahənin aşağı hissəsinə, yaxud su axarlıqlarına axıdılır (Əkbərova, 2020: 53-55).

Nəticə olaraq qeyd edilməlidir ki, olduqca böyük təbii və iqtisadi potensiala malik Xəzərsahili düzənliklərimizi mənimsənilməsi zamanı, ərazinin yaxşı öyrənilməsi, antropogen yüklənmənin norma və orta hədlərinin müəyyənləşdirilməsi olduqca mühümdür.

## Ədəbiyyat

1. Mammadov, Q. (2007). Azərbaycanın torpaq ehtiyatlartndan səmərəli istifadənin sosial-iqtisadi və ekoloji əsasları. Bakı, "Elm". 856 s.
2. Müseyibov, M., Quliyev, R. (2018). Azərbaycan respublikasının geomorfologiyası. Bakı, Avropa, 330 səh.
3. Qəribov, Y., İsmayılova, N., Sədullayev, R. (2014). Böyük Qafqazın şimal-şərq yamacı təbii landşaftlarının antropogen transformasiyasi və müasir yüklənməsinin kosmik şəkillərdən alınan informasiyalarla tədqiqi. Bakı Universitetinin Xəbərləri №4 Təbiət elmləri seriyası. 111-117 səh.
4. Məmmədov, R. (2009). Azərbaycanda landşaft Planlaşdirilması (ilk təcrübə və tətbiq). Bakı.
5. Cavadov, V. (2016). Quba-Xaçmaz iqtisadi rayonunda hündürlük qurşaqları üzrə bitkiçiliyin ərazi təşkili, Coğrafiya və təbii resurslar jurnalı, №2, Bakı.
6. https://az.wikipedia.org/
7. http://static.bsu.az/w8/Xeberler%20Jurnali/Tebiet%202006%201/138-145.pdf.
8. Əkbərova, Ü. (2020). Suvarılan qleyli-sarı torpaqların fiziki-kimyəvi xassələrinə su eroziyasının təsiri. Torpaqşünaslıq və Aqrokimya İnstitutu. Akademik Vladimir Rodionoviç Volobuyevin anadan olmasının 110 illiyinə həsr edilmiş "Torpaqların ekologiyası, meliorasiyası və energetikası" mövzusunda Elmi-Praktiki Konfransın materialları. Bakı. 53-55 səh.

Göndərildi: 02.09.2021 Qəbul edildi: 05.12.2021

DOI: https://doi.org/10.36719/2706-6185/05/54-58

**Xəyalə Mənsur qızı Məmmədova**
Bakı Dövlət Universiteti
magistrant
khayalamansur@gmail.com

# SÜRİX VƏ CENEVRƏ MALİYYƏ MƏRKƏZLƏRİNİN QURULUŞUNUN TƏDQİQİ VƏ İNKİŞAF İSTİQAMƏTLƏRİ

**Xülasə**

Avropa uzun müddət böyük ticarət və maliyyə mərkəzi olmuşdur. Bu ərazilərin maliyyə mərkəzləri kimi formalaşması ilk növbədə onların yerləşdiyi şəhərlərin tarixi coğrafi mövqeyinə əsaslanır. Təcrübəli tədqiqatlar, yüksək səviyyəli akademik təhsil və peşə təhsili və inkişaf proqramları hamısı maliyyə sektorunun müvəffəqiyyətinə qəti şəkildə kömək edir. Maliyyə sektorunun inkişafı ilə əlaqədar hazırda Avropada yerləşən əsas maliyyə mərkəzləri London, Sürix, Lüksemburq, Cenevrə, Frankfurt və Tallindir. Bu məqalədə Sürix və Cenevrə maliyyə mərkəzlərinin inkişaf tarixi və onların hazırkı fəaliyyətinin ümumi xüsusiyyətləri, inkişaf meylləri təhlil edilir.

***Açar sözlər:*** *Sürix, Cenevrə, maliyyə mərkəzi, Avropa Birliyi, inkişaf*

**Khayala Mansur Mammadova**
Baku State University
Master student
khayalamansur@gmail.com

# Study of the structure of the financial centers of Zurich and Geneva and their development trends

**Abstract**

Europe has long been a major trading and financial center. The formation of these areas as financial centers is primarily based on the historical geographical location of the cities in which they are located. Hands-on research, high-level academic education, and professional training and development programs all contribute decisively to the success of the financial sector. Due to the development of the financial sector, the main financial centers currently located in Europe are London, Zurich, Luxembourg, Geneva, Frankfurt and Tallinn. This article analyzes the history of development of Zurich and Geneva financial centers and the general features of their current activities, development trends.

***Keywords:*** *Zurich, Geneva, financial center, European Union, development*

## Giriş

Avropa hələ qədim zamanlarda ən əsas ticarət və maliyyə mərkəzi kimi formalaşmağ a başlamıştır. Bu ərazilərin maliyyə mərkəzi kimi formalaşması ilk olaraq yerləşdikləri şəhərlərin tarixi coğrafi mövqeyinə əsaslanır. Maliyyə sektorunun inkişafına görə hazırda Avropada yerləşən əsas maliyyə mərkəzləri London, Sürix, Lüksenburq, Cenevrə, Frankfurt və Tallin hesab olunur.

**Cenevrə.** Avropanın mərkəzində yerləşən Cenevrə Maliyyə Mərkəzini bir neçə yüz illik köklərə malikdir. Cenevrə, İtaliyadan Fransaya və Aralıq dənizindən Flandreya qədər böyük ticarət yollarının kəsişmə nöqtələri arasında yerləşməsi nəticəsində əhəmiyyətli bir ticarət mərkəzinə çevrildi. Maliyyələşdirmə hərəkatının başlanğıcı faizlə borc verən yepiskop Adhémar Fabi idi. Bu dövrdə - 1387-ci ildə digər xristian millətlərindən fərqli olaraq faizlə borc ola bilmək misilsiz bir imtiyaz idi. Tarixən Cenevrə Maliyyə Mərkəzinin kökləri XIV-XV əsrlərə dayanır. O dövrdə Cenevrə, tacirlərin bankirlərə

çevrildiyi Avropa ticarət kapitalının əsas mərkəzlərindən biri idi. XVII əsrdə ticarət şəbəkəsi böyüdükcə Cenevrə artan əhəmiyyətə malik qlobal ticarət məkanına çevrildi. Kalvinizmin sərbəst düşüncə ruhu bankçılıq və ticarəti daha da inkişaf etdirdi. Bu zamana qədər bankirlər ticarət şəbəkələri qurdular və Hollandiyanın East India Company, England Royal Bank, Royal Process of Mirros (ilk Avropa emalat şirkəti) və daha bir çox ticarət şirkətlərini maliyyələşdirdilər. Bankirlər məhşurlaşmağa başladılar və nazirlərə, krallara məsləhətçi kimi vəzifələrə təyin olunurdular (Global Economic Prospects, 2021).

Cenevrənin maliyyə mərkəzi olaraq daha da böyüməsində əsas addım İsveçrənin ilk fond birjasının 1857-ci ildə, Sürix və Basel birjalarının açılmasından əvvəl yaranması idi. O dövrdə birja Avropanın ən əhəmiyyətli birjalarından idi və Amsterdam, Kopenhagen, London və Parisdən sonra ən böyük beşinci birja idi. Cenevrə bankirləri, İsveçrə, Avropa və ABŞ-dakı dəmir yolu və istehsal şirkətlərini maliyyələşdirərək sənayeləşmə prosesinə də töhfə vermişdilər. Bankirlər dövlət istiqrazları buraxmaqla İsveçrənin kommersiya inkişafında da iştirak edirdilər. Bir çox bank quruldu və özəl banklar sərvət idarəçiliyinə yönəlməyə başladılar. Xarici bankların Cenevrədə filial açması da cəlbedici olmağa başladı. Bu vaxta qədər Cenevrə bir sərvət idarəetmə və ticarət mərkəzi olaraq inkişaf etmişdir. O vaxtdan bəri, Cenevrə Maliyyə Mərkəzi maliyyə sənayesinin damı olmuşdur.

Qlobal və rəqabətqabiliyyətli bir bank və maliyyə mərkəzi olaraq bu inkişafa əsas qatqı verənlər siyasi bitərəflik, hüquqi sabitlik, cəlbedici həyat standartları, müştərilərin məxfiliyinin qorunması, biznesin zəmanətliliyi və çirkli pulların yuyulmasına qarşı mübarizədə qanunverici orqanın mövcudluğudur. Cenevrə qlobal bir şəhər olmaqla yanaşı, dünyanın aparıcı maliyyə mərkəzlərindən biridir. Cenevrə İsveçrənin ikinci ən sıx məskunlaşmış şəhəridir və çox vaxt "Sülh Paytaxtı" adlandırılır. Cenevrə şəhəri Birləşmiş Millətin Avropa qərargahına ev sahibliyi edir və dünya miqyasında diplomatiya mərkəzi kimi tanınır. Ümumdünya Ticarət Təşkilatı və Beynəlxalq Qırmızı Xaç Komitəsi və Ümumdünya Səhiyyə Təşkilatının da şəhərdə qərargahları var. Cenevrə 2009-cu ildə dünyanın dördüncü ən bahalı şəhəri olaraq seçilmişdir, həyat keyfiyyətinə görə isə üçüncü yeri tutmuşdur. Cenevrə xoş isti yayları və mülayim qışı ilə fərqlənir (Global Innovation Index, 2018).

Cenevrənin imtiyazlı yeri - Avropanın kəsişməsində - tarixinin ilk mərhələsində yarmarkaların yaradılmasına və inkişafına səbəb oldu. Bunların ilk qeydləri 1187-ci ilə aiddir. XIV əsrdə şəhərdə Aralıq dənizi hövzəsi və Avropanın şimalından çoxsaylı tacir və ticarətçiləri cəlb edən illik 4 ənənəvi yarmarka var idi. Bu yarmarkalar XV əsrin birinci yarısında özlərinin ən yaxşı zamanlarını yaşayırdılar. Bu səbəbdən Cenevrə əhəmiyyətli bir bank mərkəzi olaraq inkişaf etməyə başladı: Tacirlər mübadilə, kredit və ya ödəmə tapşırıqlarının verilməsi kimi yeni fəaliyyət növləri ilə məşğul olmağa başladılar. 1387-ci ildə faizli borclar kilsə tərəfindən sərt şəkildə qınanmasına baxmayaraq yepiskop Adhémar Fabri tərəfindən buna icazə verildi. Və nəticədə bu da ticarəti asanlaşdırmış və Cenevrənin böyük bir bank mərkəzi kimi inkişafına dəstək olmuşdur (HSBC Expat Explorer Survey).

1798-ci ildə Cenevrə yerli Yakobinlərin təşəbbüsü ilə "Grande Nation"a əlavə edildi. Bunun nəticəsində bankları və sənaye sahələri zərər gördü və şəhər ciddi iqtisadi depressiyaya düşdü. Buna baxmayaraq, 1814-cü ildə Cümhuriyyətin bərpasından və 1815-ci ildə Konfederasiya üzvlüyündən sonra Cenevrə bankçılıq və saat işlərində dramatik bir yüksəliş yaşadı. Cenevrə birjası Basel və Sürixdən 25 il əvvəl, 1857-ci ildə qurulmuşdur. Cenevrə bankları həm İsveçrənin, həm də Avropanın sənaye inkişaf motoru olaraq görülürdü (Finansal Piyasalarda Düzenleyici Otoriteler, 2015: 11).

XX əsrin əvvəllərində Cenevrədə bir sıra banklar quruldu. Bu banklar tamamilə sərvət idarəçiliyi sahəsində ixtisaslaşmışdılar və 1945-ci ildə II Dünya Müharibəsinin sona çatması ilə xeyli inkişaf etdilər. Bu gün Cenevrə dünyanın aparıcı maliyyə mərkəzləri arasında altıncı yerdə, İsveçrədə ikinci yerdədir. Xüsusi sərvət idarəçiliyi baxımından birinci yerdədir. Cenevrə ölkəyə qoyulmuş xarici kapitalın yarısından çoxunu və dünyanın özəl off-shore sərvətinin (xaricə qoyulmuş) 27 faizini idarə edir. Cenevrə qlobal ticarətdə və bunun maliyyələşdirilməsində də əsas rol oynayır. 500-dən çox ticarət şirkəti Cenevrədə yerləşir və ya təmsil olunur. 60 xarici bank daxil olmaqla demək olar ki, 140 bank qurumu Cenevrədə yerləşir. Bundan əlavə, maliyyə sektoru ümumi daxili məhsulun dörddə birini təşkil edir. Cenevrənin maliyyə sektorunda 34 mindən çox insan çalışır. Beləliklə, bank sektoru şəhərin həyat keyfiyyətinə və iqtisadi sabitliyinə böyük töhfə verir (Finansal Piyasalarda Düzenleyici Otoriteler, 2015: 11).

Cenevrə Maliyyə Mərkəzi öz fəaliyyətini üç əsas strateji prioritet üzərində cəmləşdirir: Əlverişli bir iş mühitinin qorunması öhdəliyi, tanıtım və ünsiyyət təşəbbüslərində artım, maliyyə sektorundakı işçilər üçün davamlı peşə inkişafına xüsusi diqqət.

Cenevrə bir maliyyə mərkəzi olaraq çox sayda üstünlüklərə malikdir. Bunlara bilik, keyfiyyət, xidmət yönümlü və yenilikçi ruh daxildir. Beynəlxalq nüfuzu sayəsində Cenevrə yüksək ixtisaslı işçi qüvvəsindən faydalanır. İsveçrə, İşgüzar Mühit Risk Zəkasına (BERI) görə dünyada ilk 5 arasında yer alır. Cenevrənin bu güclərdən faydalanması üçün insan amili həlledici olaraq qalır. Maliyyə mərkəzi cari və hər şeydən əvvəl gələcək problemlərə cavab verə biləcək istedadlı mütəxəssisləri cəlb etməli, yetişdirməlidir və tutmalıdır.

Hal-hazırda maliyyə mərkəzi son iqtisadi, maliyyə və mədəni hadisələrə görə yeni qaydalarla bağlı dəyişiklik mərhələsindədir. Sürix Kantonu, İsveçrə Bankirlər Dərnəyi və Sürix Bank Birliyi kimi birliklər bank mərkəzinin daim inkişaf edə biləcəyi şəraiti yaratmaq üçün çalışır (Silvia Calo, Valerie Herzberg, 2019).

**Sürix.** 1755-ci ildə Bank Leu & Co. və Schweizerische Kreditanstalt'ın (indiki Credit Suisse) qurulmasıyla başlayan və 1856-cı ildə qurulmuş və ordain bəri fəaliyyət göstərən Sürix Maliyyə Mərkəzi İsveçrənin əhəmiyyətli bir regional maliyyə mərkəzi olmuş və Avropa maliyyə bazarında ilk ikilikdə yerləşmişdir. Sürətli böyümə, sənayeləşmə, yerləşmə, mövcud bank qurumları və əsasən daha çox kapital tələb edən dəmir yolu xəttlərinin maliyyələşdirilməsi ilə əlaqələndirilə bilər. Sürixin mərkəzdə yerləşməsi 1892-ci ildə mərkəzini Berndən Sürixə köçürən Eidgenössische Bankı (EIBA) kimi böyük quruluşları cəlb etdi. 1912-ci ildə Winterthurdakı Bank mərkəzi də Sürixdə yerləşən Schweizerische Bankgesellschafta (SBG) çevrildi. Artıq 1908-ci ildə EIBA, SBG, Bank Leu və Schweizerische Kreditanstalt yeddi ən böyük İsveçrə Bankının balans cəminin 50%-ni təşkil edirdi və beləliklə bu da daim böyüyən Sürix Maliyyə Mərkəzi üçün güclü bir başlanğıc olmuşdur.

Aşağıda Sürix Maliyyə Mərkəzinin mövcud vəziyyətini təsvir edən əsas hadisələrin qısa xülasəsi verilmişdir:

1755-1928-ci illər: Sürix Maliyyə mərkəzi 1755-ci ildə Bank Leu & Co-nun qurulması ilə başlayıb, ardından 1856-cı ildə Alfred Escher tərəfindən Credit Suisse'nin qurulması, İsveçrə Federal Dövlətinin qurulması, standart valyutanın-frankın qəbul olunması, Sürixin və qonşu kantonların mədəni və iqtisadi təcrid olunmaması üçün Avropanın qalan hissəsi ilə əlaqələndirən bir dəmir yolu inşa edilməsi kimi güclü köklərə sahib idi (Lannoo, 2007).

1929-1939-cu illər: Birinci Dünya Müharibəsinin sona çatması və 1929-cu ildə başlayan böyük depressiya ilə bu on ilə yaxın bir müddət 1931-ci il Alman Bank Krizi və 1934-cü ildə İsveçrə Federal Bankçılığı tərəfindən qəbul edilmiş İsveçrə Federal Bank Qanunu ilə maliyyə mərkəzini formalaşdırdı. Müştərilərin əmanətlərini qoruyan komissiya (indiki FINMA), Sürix Maliyyə Mərkəzinin dünya miqyasında artan cazibəsinin yalnız başlanğıcı idi.

1940-1979-cu illər: Bu dövrdə yüksək ixtisaslı işçi qüvvəsi və sonrakı illərdə sabit bazar şərtlərini mövcud olmuşdur. Əmanət nisbəti yüksək, milli büdcə sabitləşdi, frank sabit və inflyasiya aşağı idi. Bu ideal şərtlər xarici bankları İsveçrədə, xüsusən Sürixdə mağazalar açmağa cəlb etdi.

1980-ci illər: Paradiqma dəyişikliyi 1980-ci illərdə, bankların məhsullarını və xidmətlərini yüksək gəlir gətirən qlobal investisiya bankçılığına daxil etmək üçün genişləndirdikləri zaman baş verdi. Kapital əməliyyatları, məsləhət xidmətləri, birləşmə, müştərilər adına birja ticarəti kimi yüksək riskli fəaliyyətlər ön planda olmuş və banklar tərəfindən geniş tətbiq olunmuşdur (The Global Financial Centre Index).

1990cı illər-indiki dövr: Mülk böhranı və bəzi regional bankların səmərəsizliyi, Bank & Leu və Schweizerische Volksbank kimi bankların Credit Suisse tərəfindən satın alınmasına və Winterthur Insurance kimi bankların 1997-ci ildə sığorta sektoruna girməsinə səbəb oldu. Üstəlik, SBV və SBG-nin UBS ilə birləşməsilə iki böyük bank üçün yeni bir dövr başladı. 2005-ci ildə faiz gəlirlərindən vergi tutulmasını təmin etmək və saxtakarlığa qarşı daha da mübarizə aparmaq üçün AB ilə ikitərəfli II müqavilələr imzalanmışdır. Böyük bir hadisədən biri olan ABŞ-ın baş nazirlik böhranı, ABŞ-ın güclü investisiya banklarının sona çatmasına gətirib çıxarmışdır və bu, Sürix Maliyyə Mərkəzinə təsir göstərirdi, çünki dünya miqyasında fəaliyyət göstərən banklar öz kapitalını ya özəl investisiyalar, ya da

özəl kapitalları hesabına qazanmalı idilər. Balanslarını dəstəkləyin və azaldın. Ən əsası, parlament, bankların 2018-ci ilə qədər daha sərt likvidlik qaydalarına riayət etmələri, daha geniş bir risk profilinə sahib olmaları və lazım olduğu kimi təşkilatlanmaları üçün daha yüksək kapital səviyyəsini qurmalarına imkan verən "uğursuz olmayacaq qədər böyük" dəyişikliyini təsdiqləyir. Banklar fəaliyyət göstərə bilmirsə, milli iqtisadiyyat iflas təhlükəsi ilə üzləşməyəcəkdir (The role of financial centres in driving economic growth).

Sürixin ən əhəmiyyətli beynəlxalq maliyyə mərkəzlərindən birinə çevrilməsinə İkinci Dünya Müharibəsindən sonra İsveçrədən və xaricdən varlı müştərilərə göstərilən hərtərəfli sərvət idarəetmə xidmətləri sayəsində başlanıldı. 1950-ci illərin ortalarından etibarən maliyyə sisteminin beynəlxalqlaşması bank mərkəzinin böyüməsini daha da gücləndirməyə kömək etdi. Hal-hazırda banklar, sığorta şirkətləri, digər maliyyə xidmətləri təminatçıları və yenilikçi FinTech və InsurTech şirkətləri Sürix iqtisadiyyatının güclü təkanına qəti şəkildə kömək edirlər.

Banklar və sığorta şirkətləri yerli əmək bazarının əsas sütunlarıdır. Banklar təqribən 50.000, sığorta şirkətləri təxminən 22.000 iş yeri təmin edir (tam zamanlı ekvivalentlərlə ölçülür). Bu, Sürix bölgəsindəki bütün işlərin 7%-ə uyğundur. Bu məbləğə digər maliyyə xidmətləri təminatçıları əlavə edilərsə, Sürix bölgəsindəki hər on işdən biri maliyyə sektorundan asılıdır. İri banklar və sığorta şirkətləri Sürix bölgəsindəki ən vacib işəgötürənlər arasındadır və maliyyə sektorundakı işlərin demək olar ki yarısını təşkil edirlər. Banklar, sığorta şirkətləri və digər maliyyə xidmətləri təminatçılarından ibarət olan Sürix maliyyə mərkəzinin ümumilikdə təxminən 91.000 iş yeri təmin edir (Zurich Financial Center Facts and Figures, 2019/2020).

Yüksək ixtisaslı işçilərin mövcudluğu istənilən iqtisadi mərkəz üçün əsas rəqabət amillərindən biridir. Bu məqsədlə Sürix bankları və sığorta şirkətləri gənc işçilər üçün cəlbedici təlim imkanlarına investisiya yatırırlar. Təklif olunan təlim ticarət və İT şagirdliklərindən, orta məktəb məzunları üçün təqdimat proqramlarından, universitet tələbələri üçün təcrübə və universitet məzunları üçün təlim proqramlarına qədər dəyişir. Ümumilikdə, Sürix bölgəsindəki maliyyə sektorunda təxminən 3500 gənc peşə təhsili alır. Buraya yalnız Sürix Kantonunda təxminən 1300 ticarət şagirdi və 400-dən çox İT şagirdi daxildir (Zurich Financial Center Facts and Figures, 2019/2020).

Təcrübəli tədqiqatlar, yüksək səviyyəli akademik təhsil və peşə təhsili və inkişaf proqramları hamısı maliyyə sektorunun müvəffəqiyyətinə qəti şəkildə kömək edir. Sürixdə və ətrafında təklif olunan yüksək keyfiyyətli təhsil proqramları, yeni peşə və tələbləri əhatə etmək üçün lazımi düzəlişlər daxil olmaqla sənaye və təhsil müəssisələri arasında sıx əməkdaşlıq şəraitində formalaşdırılır və inkişaf etdirilir. Bu, işçilərin peşəkar karyeralarında bacarıq və təcrübələrini artırmağa və yeniləməyə imkan verir.

Sürix müəssisələr üçün olduqca cəlbedici bir yerdir. Bunun bir səbəbi, çox sayda bank və sığorta şirkəti sayəsində daha böyük və ya kiçik müəssisələrin geniş miqyaslı maliyyə xidmətləri, yüksək keyfiyyətli və cəlbedici şərtlərdən faydalana bilməsidir. Ticarət risklərinin xarici hedcinqi və kredit kapitalının mövcudluğu hər hansı bir təşəbbüskarlıq fəaliyyəti üçün həlledici şərtdir. Sürix bölgəsində verilən korporativ kreditlərin ümumi həcminin təqribən 100 milyard İsveçrə frankı olduğu təxmin edilir (10).

Yerli banklar və sığorta şirkətləri bölgədəki bütün cari hesablardan, ödəmə əməliyyatları xidmətlərindən və ixrac maliyyələşdirməsindən tutmuş hər növ fərdi və əmlak sığortaları ilə əlaqəli məsləhət və dəstəyə qədər bütün ehtiyaclarını ödəmək iqtidarındadır. Hər il Sürix ərazisindəki startuplar risk kapitalının təmin edilməsi ilə dəstəklənir, beləliklə bölgənin yenilik mərkəzi və günəş doğma sahələrində iş yaradan kimi davam etməsinə kömək edir.

Sürix yalnız İsveçrənin ən əhəmiyyətli maliyyə mərkəz deyil, həm də böyük beynəlxalq əhəmiyyətə malikdir. İsveçrədəki banklar tərəfindən idarə olunan müştəri aktivləri təxminən 7,2 trilyon İsveçrə frankını təşkil edir ki, bunun da 2,2 trilyondan çoxu İsveçrə xaricindəki özəl müştərilərdir. Bu, qlobal bazar payının 27%-dən çoxuna cavab verir və İsveçrəni beynəlxalq sərvət idarəçiliyində lider halına gətirir. Ümumilikdə, İsveçrə bankları xaricdəki müştərilər üçün ildə 15 milyard İsveçrə frankı dəyərində xidmətlər göstərirlər.Sərhədlərarası bankçılıq beləliklə İsveçrə və Sürix üçün əhəmiyyətli bir ixrac sənayesidir və iqtisadi baxımdan əhəmiyyətli bir amildir (Zurich Financial Center Facts and Figures, 2019/2020).

İsveçrə sığorta sənayesi əla mövqedədir və güclü beynəlxalq şəbəkəyə malikdir. Sənayə həm də maliyyə bazarı böhranları boyunca çox sabit olduğunu sübut etmişdir. 2017-ci ildə İsveçrənin özəl sığorta şirkətləri tərəfindən təmin edilən iş sayı İsveçrədə 47.000, xaricdə isə 72.000 nəfər təşkil etmişdir.

Rəqəmsallaşmanın irəliləməsi bir çox sənayeni kökündən dəyişdirir. Bank işi və sığorta da burada istisna deyil. Fərdi xidmət vacibdir, lakin rəqəmsal rabitə və paylama kanalları genişlənməkdədir. Bütün bunlar inzibati proseslərin avtomatlaşdırılması, məsləhət xidmətlərində rəqəmsal dəstək və yeni məhsulların yaradılması üçün də eynidir.

Sürix maliyyə mərkəzindəki ayrı-ayrı bankların və sığorta şirkətlərinin gələcək uğurları böyük ölçüdə blockchain texnologiyası kimi perspektivli həllərin mövcudluğu və səmərəli istifadəsi ilə əlaqəli olacaqdır. Bununla birlikdə, bu, əhəmiyyətli, uzaqgörən investisiyalar və cəsarətli fəaliyyətlər tələb edir. Sürix bölgəsi, maliyyə və sığorta texnologiyaları sənayesində (FinTech/InsurTech) yenilikçi şirkətlər üçün dinamik bir mərkəzə çevrilir və bu sahədə İsveçrə cəlb etdiyi startupların sayına görə fərqlənir. Zürih şəhəri və Kantonu və Sürix Bank Birliyi bu inkişafa bir çox ortaq və fərdi fəaliyyət sayəsində dəstək verməyi qərarlaşdırıb (11).

## Nəticə

Güclü maliyyə sektoru olan Sürix bölgəsi davamlı investisiyalar sahəsində lider rolunu almaq üçün əla vəziyyətdədir. Uzunmüddətli perspektivdə cəlbedici və rəqabətli bir maliyyə mərkəzi üçün imkanlara yol açdığından bu potensialdan istifadə edilməlidir. Zürih şəhəri və Kantonu və Sürix Bank Birliyi İsveçrə Davamlı Maliyyələşdirmə dərnəyi ilə birlikdə Sürix maliyyə mərkəzində şaxələndirməni təşviq etməyi qərarlaşdırıb.

Sürix bölgəsi həm də yüksək yaşayış keyfiyyəti, hava limanı və ictimai nəqliyyat daxil olmaqla inkişaf etmiş bir infrastruktur və yüksək ixtisaslı işçilərlə çevik iş bazarı ilə xarakterizə olunur. Bu xüsusiyyətlərin birləşməsi bölgəni dünyanın ən cəlbedici iş yerlərindən birinə çevirir. Gələcəkdə maliyyə və informasiya texnologiyaları sahəsindəki imkanları birləşdirərək və qabaqcıl təhsil müəssisələri ilə əməkdaşlıq edərək daha da böyüməyə hazırdır (12).

## Ədəbiyyat

1. Global Economic Prospects. (2021). The World Bank. January.
2. Global Innovation Index. (2018).
3. HSBC Expat Explorer Survey.
4. Finansal Piyasalarda Düzenleyici Otoriteler. 2015. TSPB Gösterge, Kış.
5. Silvia Calo, Valerie Herzberg. (2019). The Future of Global Financial Centres after Brexit: an EU Perspective No. 9 Vol.
6. Lannoo, K. (2007). The Future of Europe’s Financial Centres, ECMI Policy Brief No.10, December.
7. The Global Financial Centre Index (GFCI) 29.
8. The role of financial centres in driving economic growth. WORLD ALLIANCE of International Financial Centers, 30 pp.
9. Zurich Financial Center Facts and Figures 2019/2020 edition.
10. www.financeestonia.eu
11. www.geneve.ch
12. www.longfinance.net

Göndərildi: 14.09.2021 Qəbul edildi: 01.12.2021

# İÇİNDƏKİLƏR



Çapa imzalanmışdır: 27.09.2021
Kağız formatı: 60/84, 1/8
H/n həcmi: 7,5 ç.v.
Sifariş: 445

---

https://aem.az saytında çap olunub.
Ünvan: Bakı şəh., Mətbuat prospekti, 529-cu məh.
Tel.: +994 50 209 59 68
+994 55 209 59 68
+994 12 510 63 99
e-mail: info@aem.az